# GƏNC MÜƏLLİM

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

**BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!**
*Məhəmməd Peyğəmbər (S.)*

Mart 2013 03 (1047)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ




## "Azərbaycan Respublikasında 2013-cü ilin "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilməsiilə bağlı Tədbirlər Planı"nın təsdiq olunması haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

"2013-cü ilin Azərbaycan Respublikasında "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 16 yanvar tarixli 2664 nömrəli sərəncamına uyğun olaraq və Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq **qərara alıram:**

"Azərbaycan Respublikasında 2013-cü ilin "İnformasiya-kommunikasiya texnologiyaları ili" elan edilməsi ilə bağlı Tədbirlər Planı" təsdiq edilsin (əlavə olunur).

2. Bu sərəncamın 1-ci hissəsində nəzərdə tutulmuş Tədbirlər Planının icrasının təşkilində əlaqələndirici orqan Azərbaycan Respublikasının Rabitə və İnformasiya Texnologiyaları Nazirliyi müəyyən edilsin.

3. Naxçıvan Muxtar Respublikasının Nazirlər Kabineti Naxçıvan Muxtar Respublikasının ərazisində informasiya-kommunikasiya texnologiyalarının inkişafı və ondan istifadə, elektron hökumətin formalaşdırılması üzrə tədbirlərin həyata keçirilməsini təmin etsin.

4. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 28 mart 2013-cü il*

## "Azərbaycan filmlərinə səyahət" adlı Novruz şənliyi



Novruz Azərbaycan xalqının maddi və mənəvi dəyərlərinin mühüm bir hissəsini özündə əks etdirən mədəniyyətdir. Novruz yeni ilin - baharın gəlişinin bayram edilməsidir. Novruz-Azərbaycan xalqının ən qədim milli bayramlarından biridir.



Respublikamızın bütün təhsil müəssisələrində Novruz bayramı ilə bağlı müxtəlif tədbirlər keçirilmişdir. Azərbaycan Dövlət Pedaqoji Universitetində də (ADPU) mart ayının 15-də Novruz bayramına həsr edilmiş "Azərbaycan filmlərinə səyahət" adlı tədbir keçirilib. Tədbirdə təqdim olunan teatrlaşdırılmış kompozisiyada vurğulanıb ki, Novruz Şərq xalqlarının, o cümlədən Azərbaycan xalqının ən qədim bayramlarındandır. Tədbir Yeni Azərbaycan Partiyasının (YAP) ADPU Qadınlar Şurasının təşəbbüsü və təşkilatçılığı ilə reallaşmışdı. Milli geyimlər, atributlar, zövqlə bəzədilmiş səhnə tərtibatı Novruz adət-ənənələrini özündə əks etdirirdi. Bayrama həsr edilmiş tədbir foyedən başlandı. Gələn qonaqlar bayram süfrəsinə dəvət olunurdu. Masanın üstünə Novruz simvolları olan səməni, paxlava, şəkərbura, boyalı yumurta düzülmüşdü. Tədbir iştirakçıları böyük məmnuniyyətlə bu naz-nemətlərdən dadırdılar.

Tamaşa başlamamışdan əvvəl Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin tələbələrinin əl işləri, xalçaçılıq nümunələri, tikmələr, boya ilə işlənən rəsmlər sərgiləndi. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov bu sərgiyə tamaşa edərək təqdim olunmuş işləri yüksək qiymətləndirdi. Universitetdə böyük bayram əhval-ruhiyyəsi yaşanırdı.

Bayram mərasimi Bahar qızın canlı ifası ilə başlandı. 2 saylı musiqi məktəbinin nağaraçılar qrupun şagirdləri, uşaq rəqs qrupu, Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin 302-ci qrup tələbəsi Nərminə Məlikzadənin ifa etdiyi "Lalələr" rəqsi alqışlarla qarşılandı. Tədbir Novruz bayramının personajları olan Kosa, Keçəl və Bahar qızın çıxışı ilə davam etdirildi.

Ən yaddaqalan məqam isə Azərbaycan filmlərinə səyahət idi. "Sehrli xalat", "Dəli Kür", "Arşın mal alan" filmindən fraqmentlər nümayiş etdirildi. Təqdim olunan kompozisiyada xalqımızın qədim adət-ənənələrini özündə əks etdirən Novruz bayramının elementlərindən ibarət surətlər canlandırıldı. Kinofilmlərdən göstərilən fraqmentlər tamaşaçıları bir anlıq da olsa uzaq keçmişə apardı. Tədbirdə iştirak edən bütün tamaşaçıların simasında bayram ovqatı yaşanırdı.

Şənliyin ən maraqlı məqamlarından biri də fakültələr arasında xonça müsabiqəsi keçirilməsi oldu. "Ən yaxşı Novruz xonçası" adı uğrunda yarışma şənliyin şuxluğunu daha da artırdı.

Sonda rektor Yusif Məmmədov bu yüksək səviyyəli bayram tədbirinin hazırlanmasında zəhmət çəkmiş şəxslərə minnətdarlığını bildirdi.

Sonda onu da qeyd edək ki, tamaşada istifadə olunan dekorasiya işləri YAP-ın ADPU Qadınlar Şurasının üzvlərinin - sədr, dosent Laçın Həsənova, üzvlərdən Nigar Rəhimova, professor Zemfira Abdullayeva, professor Rəfiqə Məmmədova, dosent Səadət Mazanova, dosent Sevinc Cəlilova və tələbələrimizin yaradıcı fəaliyyəti nəticəsində ərsəyə gəlmişdi.

**Şəfa Əhmədova,**
**ADPU-nun əməkdaşı**





# 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş dəyirmi masa

1918-ci il mart ayının 31-də namərd və xain qonşularımız olan ermənilərin xalqımıza qarşı törətdikləri soyqırımından 95 il keçir. Bu günlər respublikamızda və dünyanın bir çox ölkələrində 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş müxtəlif tədbirlər keçirilir. Həmin tədbirlərdə ermənilərin tarixən xalqımıza, millətimizə qənim kəsilərək deportasiya siyasəti yürütmələri və soyqırımları həyata keçirmələri fikri xüsusi qeyd edilir. Bu baxımdan, 1918-ci ilin 31 mart soyqırımı xüsusi qəddarlığı ilə seçilir. Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu il mart ayının 29-da 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş dəyirmi masada da həmin dövrün tarixi-siyasi şəraiti ətraflı təhlil olunmuş, tələbə-gənclərə belə faciələrdən lazımi nəticə çıxarmaq tövsiyə edilmişdir.

ADPU-da keçirilən dəyirmi masanı universitetin rektoru, AMEA-nın müxbir üzvü, professor Yusif Məmmədov açmışdır. Öncə 31 mart soyqırımı zamanı həlak olmuş soydaşlarımızın və ümumiyyətlə, bütün şəhid soydaşlarımızın xatirələri bir dəqiqəlik sükutla yad edilmişdir.

Rektor Y.Məmmədov çıxışında bildirmişdir ki, ermənilərin öz havadarlarının köməyi ilə xalqımıza qarşı həyata keçirdikləri genosid siyasətinin kökü tarixin dərinliklərinə gedib çıxır. Təxminən 200 il ərzində ermənilər azərbaycanlıların başına olmazın müsibətlər, faciələr gətirmiş, xalqımıza qarşı deportasiya və soyqırımı siyasəti həyata keçirmişlər. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin qeyd etdiyi kimi, «Erməni millətçiləri tərəfindən xalqımıza qarşı həyata keçirilən soyqırımı və təcavüz siyasətinin iki yüz ilə yaxın bir tarixi vardır. Bu mənfur siyasətin məqsədi azərbaycanlıları tarixi torpaqlarından qovmaq, bu ərazilərdə erməni tarixçilərinin və ideoloqlarının uydurduğu «Böyük Ermənistan» dövləti yaratmaq idi. Xalqımızın tarixi kobud şəkildə saxtalaşdırılmış, maddi və mədəniyyət abidələrimiz, toponimlərimiz erməni tarixçiləri və «ideoloqlarının» təcavüzünə məruz qalmışdır». Cənab Prezidentin qeyd etdiyi kimi, məhz ermənilərin etnik təmizləmə siyasəti nəticəsində tarixən əzəli Türk torpaqları sayılan Qərbi Azərbaycanda bu gün bir nəfər də olsun azərbaycanlı qalmamışdır. Bunu faktlar da birmənalı şəkildə təsdiqləyir. XIX əsrin əvvəllərində müasir Ermənistanın ərazisində 2 mindən artıq azərbaycanlı kəndi olmuşdur. Bu gün isə ermənilərin deportasiyası və kütləvi saxtalaşdırma siyasəti nəticəsində həmin yerlərdə nə bir azərbaycanlı qalıb, nə də bir Azərbaycan adı. Gəlin, Çar Rusiyası və Sovet hakimiyyəti illərində Ermənistanın etnik mənzərəsinin necə dəyişdiyini özündə dolğun əks etdirən maraqlı bir statistikaya nəzər yetirək: 1850-ci il - 76% azərbaycanlı, 24% erməni; 1910-cu il - 64% azərbaycanlı, 33% erməni; 1948-ci il - 52% azərbaycanlı, 48% erməni; 1990-cı il - 98% erməni, 2% digər millətlər.



Elmi-tarixi mənbələr göstərir ki, Türkmənçay müqaviləsindən sonra Rusiya imperatoru I Nikolayın 21 mart 1828-ci il tarixli fərmanı ilə İrəvan və Naxçıvan xanlıqları ərazisində «Erməni vilayətinin» yaradıldığı elan edilmiş, 7331 azərbaycanlı və 2369 erməni ailəsinin məskunlaşdığı İrəvan şəhəri də bu vilayətin tərkibinə daxil edilmişdir. Məhz həmin fərmandan sonra 1829-1830-cu illərdə Qafqaza İrandan 40 min, Türkiyədən 84 min 600 erməni köçürülmüş və onlar əsasən Naxçıvan, Qarabağ və İrəvanda yerləşdirilmişdir. Digər tərəfdən, uzun sürən müharibə illərində azərbaycanlıların yaşadıqları yüzlərlə yaşayış məntəqələri məhv edilmiş, minlərlə insan öldürülmüş, on minlərlə insan öz tarixi ata-baba yurdlarını tərk etmişlər. Maraqlı olan başqa bir fakt da var. Belə ki, 1979-cu ilin siyahıyaalınmasına əsasən Ermənistanda 160 min azərbaycanlı (?) və 70 min rus yaşayırdısa, 2001-ci ilin məlumatlarında azərbaycanlıların heç adı da çəkilmir, rusların sayının isə 14 min nəfər olduğu bildirilir.

Rektor Y.Məmmədov bildirmişdir ki, ermənilərin xalqımıza qarşı törətdikləri vəhşiliklərin arasında 1918-ci ilin mart hadisələri xüsusi amansızlığı və qəddarlığı ilə yadda qalmışdır. 1918-ci ilin mart hadisələri zamanı azərbaycanlıların ermənilər tərəfindən kütləvi surətdə qırılması halı baş vermişdir. Belə ki, ermənilər yeni təqvimlə 1918-ci il martın 31-dən aprelin 2-nə (köhnə təqvimlə isə martın 18-dən 21-dək) qədər Bakıda 17000, Şamaxıda isə 8000-dən çox dinc azərbaycanlı sakini xüsusi qəddarlıqla qətlə yetirmişlər. Qətlə yetirilənlərdən 2500 nəfərdən çoxu qadın, 200-ü isə uşaq olmuşdur. Bütövlükdə isə 1918-ci ilin mart hadisələri zamanı ermənilər 50 mindən çox azərbaycanlını öldürmüş, 10 mindən çox insanı isə öz yaşayış yerlərini qoyub qaçmağa məcbur etmişlər. Erməni vandalistləri eləcə də Qubada, Lənkəranda, Dağlıq Qarabağda, Qərbi Azərbaycanda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində 10 minlərlə dinc mülki vətəndaşı qətlə yetirmişlər. Ermənilərin bu vandalist aktının işlənib hazırlanmasının və həyata keçirilməsinin əsas ideoloqu daşnak xislətli Stepan Şaumyan olmuşdur. Özü də bu Sovet tarix elminin uzun müddət iddia etdiyi kimi, sinfi mübarizə və vətəndaş müharibəsi deyil, məhz ermənilərin xalqımıza qarşı törətdiyi əsl soyqırımı olmuşdur. Yalnız Türk dünyasının igid oğlu, Qafqaz İslam Ordusunun yaradıcısı və komandanı Nuru Paşanın Azərbaycana gəlişi ermənilərin vəhşi hərəkətlərinin qarşısını ala bilmişdir. Eyni zamanda bir faktı da xüsusi qeyd etmək istəyirəm ki, 1918-ci ilin qanlı 31 mart hadisələri may ayının 28-də Azərbaycan Xalq Cümhuriyyətinin elan edilməsinə gətirib çıxardı. Yəni 31 mart soyqırımı xalqımızın vətənpərvər, millətsevər oğulları qarşısında milli hakimiyyət və milli dövlət qurmağın vacibliyini həyati əhəmiyyətli bir vəzifə kimi qoydu və nəticədə 28 mayda Azərbaycan Xalq Cümhuriyyəti yaradıldı.

Qeyd edim ki, 6 il bundan öncə aşkar edilmiş Quba Soyqırımı Memorial Xatirə Kompleksi də 1918-ci ildə baş vermiş erməni vəhşiliklərinin əyani sübutudur. Onu da qeyd edim ki, bu il martın 22-də ABŞ-ın Nyu-Cersi ştatında ermənilərin 1918-ci il martın 31-də azərbaycanlılara qarşı törətdikləri soyqırımı faktı haqqında akt qəbul edilmişdir. Bütövlükdə ABŞ-da bu məsələyə hazırda ciddi diqqət yetirilir. Diqqətinizə onu da çatdırmaq istəyirəm ki, Quba rayonunda bu günlər AMEA-nın, beynəlxalq təşkilatların və rayon ictimaiyyətinin nümayəndələrinin iştirakı ilə 31 mart soyqırımına həsr edilmiş üçgünlük beynəlxalq konfrans keçirilir. Bu beynəlxalq konfransın keçirilməsində məqsəd dünya ictimaiyyətinin diqqətini yenidən erməni vəhşiliklərinə yönəltməkdir.

Digər milli facilərimiz kimi, ermənilərin öz himayədarlarının köməkliyi ilə 1918-ci ilin martında xalqımıza qarşı törətdikləri soyqırımına da yalnız ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsü və birbaşa rəhbərliyi ilə dolğun və hərtərəfli siyasi-hüquqi qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı 690 saylı fərmanla 31 Mart dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü elan edilmişdir.

Rektor Y.Məmmədov öz çıxışında qeyd etmişdir ki, biz həmişə hər yerdə ermənilərin vandalist əməllərini bütün çılpaqlıqları ilə açıb göstərməli, dünya ictimaiyyətinə və beynəlxalq təşkilatlara bu barədə obyektiv məlumatların çatdırılması üçün bütün imkanlarımızdan istifadə etməliyik. Başda ölkə Prezidenti cənab İlham Əliyev olmaqla Azərbaycan dövləti bu vacib istiqamətdə bütün tədbirləri həyata keçirilir. Ölkənin birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YUNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın bu vacib istiqamətdə gerçəkləşdirdiyi səmərəli fəaliyyətini xüsusi qeyd etmək lazımdır. Eyni zamanda biz də bir Azərbaycan vətəndaşı olaraq tarix boyu ermənilərin xalqımıza qarşı törətdikləri vəhşilikləri, soyqırımlarını Azərbaycan gəncliyinə konkret faktlarla, sübutlarla göstərməliyik. Tələbə-gəncləri milli ruhda tərbiyə etməli, onlara ermənilərlə bağlı bütün tarixi həqiqətləri çatdırmalıyıq. Özü də bu istiqamətdə iş apararkən biz tarixi keçmişimizlə bu günümüzü əlaqələndirməyi bacarmalıyıq. Hazırda Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin həlli ilə bağlı dinc sülh danışıqları davam edir. Azərbaycan Prezidenti cənab İlham Əliyevin qeyd etdiyi kimi, yalnız Ermənistanın qeyri-konstruktiv mövqeyi, eləcə də beynəlxalq təşkilatların münaqişənin həllinə ikili standartlarla yanaşmaları üzündən problemin həlli ləngiyir. Riyakar ermənilər həmişə olduğu kimi, yenə də öz çirkin məqsədlərinə çatmaq üçün tarixi həqiqətləri təhrif edir, beynəlxalq ictimaiyyətin diqqətini əsl həqiqətdən azdırmağa, yayındırmağa çalışırlar.

Rektor Y.Məmmədov çıxışının bu məqamında dedi: “Dövlət başçımız cənab İlham Əliyev bütün mötəbər toplantılarda birmənalı şəkildə qeyd edib ki, Qarabağ münaqişəsi yalnız xalqımızın milli maraqları çərçivəsində, beynəlxalq hüququn norma və prinsipləri əsasında həll ediləcəkdir. Buna müstəqil Azərbaycan dövlətinin günü-gündən artan siyasi nüfuzu, iqtisadi və hərbi qüdrəti imkan verir. Azərbaycan hazırda regionun aparıcı lider dövləti, mühüm regional və transmilli layihələrin uğurla həyata keçirildiyi bir ölkədir. Azərbaycan öz enerji təhlükəsizliyini təmin edə bilir. Dövlətimiz müstəqil xarici siyasət yürüdür. Ermənistan isə bütün beynəlxalq layihələrdən kənarda qalaraq, təcrid olunmuş bir vəziyyətdə yaşayır. Ermənistanda siyasi və iqtisadi böhran günü-gündən dərinləşir. Ermənistan faktiki olaraq bəzi böyük dövlətlərdən asılı vəziyyətdədir. Əslində o, vassaldır. Bir sözlə, Azərbaycan bütün göstəricilərinə görə Ermənistanı çox geridə qoyub və bu Dağlıq Qarabağ probleminin məhz bizim xeyrimizə həll ediləcəyinə etibarlı zəmin yaradan ən vacib amillərdən biridir”.

Rektor Y.Məmmədov çıxışının sonunda universitetin bütün fakültələrində, xüsusilə də Tarix və Filologiya fakültələrində belə tədbirlərin müntəzəm keçirilməsinin vacibliyini bildirmiş və tələbə-gənclər arasında bu mövzuda daim təbliğat aparılmasını tövsiyə etmişdir.

Dəyirmi masada Tarix fakültəsinin dekan müavini, dosent Nazir Əsədov və Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müəllimi Taleh Cəfərov məruzə ilə çıxış etmişlər. Hər iki məruzəçi öz çıxışlarında həmin dövrdə Azərbaycanda və Cənubi Qafqazda, həmçinin Türkiyədə və bütövlükdə dünyada baş verən ictimai-siyasi hadisələri ətraflı və dolğun təhlil etmiş, ermənilərin 31 mart soyqırımı zamanı törətdikləri vəhşiliklər haqqında dəyirmi masa iştirakçılarına konkret elmi-tarixi faktlar əsasında geniş məlumat vermişlər.

Dəyirmi masada Fizika fakültəsinin dekanı, professor Mirzəli Murquzov və Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev çıxış edərək xalqımızın tarixən mərd və cəsur bir xalq olduğunu, ermənilərin isə həmişə yalnız öz havadarlarının köməyi ilə xalqımıza qarşı soyqırımı həyata keçirə bildiklərini xüsusi qeyd etmişlər.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**





## Ümummilli lider Heydər Əliyev - 90

# TƏHSİLİMİZİN KEŞİYİNDƏ

## *Ulu Öndərlə görüşlərimi xatırlayarkən...*

Müstəqil Azərbaycan dövlətinin memarı, ulu öndər Heydər Əliyevin nəhəng fəaliyyətində təhsil quruculuğu sahəsindəki geniş və çoxcəhətli fəaliyyətinə dair çox yazılmışdır. Bu gün Ulu Öndərin 90 illik yubileyinin xalqımız tərəfindən böyük təntənə ilə qeyd edildiyi bir dövrdə də yeni-yeni əsərlər, məqalələr yazılır və gələcəkdə də yazılıcaq. Mən də öz növbəmdə bu mövzu ilə bağlı bir sıra məqalələr dərc etdirmişəm və hər bir məqaləni belə bir epiqrafla başlamışam və bu, bir həqiqətdir ki, Heydər Əliyev kimi oğulu analar 100 ildə bir dəfə dünyaya gətirər.

• Heydər Əliyev adi şəxs deyil, sadəcə şəxsiyyət deyil, böyük tarixi şəxsiyyətdir.

• Heydər Əliyevin yaradıcılığı millətimiz üçün mənəvi örnək və ləl-cəvahirat xəzinəsi idi.

• Heydər Əliyevin fəaliyyətinin kökündə vətənpərvərlik, onun şaxələrində isə xalqa sədaqətlə xidmət dururdu.

• Heydər Əliyevin baxışında dərin məna, duruşunda qürur, geyimində şuxluq, yerişində şahanəlik var idi.

Bu böyük insanla bir neçə dəfə yaxından görüşmək mənə də nəsib olub. Mən onu ilk dəfə yaxından institutumuzun (indiki ADPU-nun) böyük akt zalında görmüşəm. 1969-cu ilin ortalarında Azərbaycana rəhbər vəzifəyə seçilən Heydər Əliyev fəaliyyətinin ilk günlərindən ali məktəbləri, oradakı kadr hazırlığının vəziyyətini daim diqqət mərkəzində saxlayar, ali məktəblərə qayğı göstərər, ali məktəblərin professor-müəllim heyəti ilə görüşərdi. Belə görüş-lərdən biri də 1971-ci ilin dekabr ayında bizim institutda oldu. İnstitutun böyük akt zalı, necə deyərlər ağzına qədər dolu idi. Heydər Əliyevin bura gəlişi böyük maraqla qarşılandı. Tribunaya qalxan Heydər Əliyev ana dilində, doğma Azərbaycan dilində böyük və dərin məzmunlu tarixi bir nitq söylədi. Açığını deyim ki, bizlər o zamankı rəhbər işçilərin ana dilində deyil, rus dilində məruzə etmə-lərinə bir növ öyrənmişdik. Lakin bu böyük şəxsiyyətin ana dilində, həm də çox səlis, rəvan və məzmunlu nitqi bizləri heyran etdi. Heydər Əliyev şəxsiyyətinə hörmət və ehtiramımızı birə yüz artırdı. Onun bu tarixi çıxışı kollektivimizin ruh yüksəkliyinə və elmi-pedaqoji yaradıcılıq əzminin yüksəlməsinə böyük təkan verdi. Heydər Əliyevin APİ-dəki görüşündən yaddaşımda qalan bir epizodu heç unutmaram. Görüşün sonunda institutumuzun qocaman professorlarından Azərbaycan tarixi kafedrasının müdiri Nəzər Paşayev Heydər Əliyevə "Yoldaş Əliyev, Nəriman Nərimanovun 100 illik yubileyinin gecikməsinin səbəbi nədir?" deyə müraciət etdi. Heydər Əliyevin cavabı belə oldu: "Tarixçi sizsiniz, N.Nərimanovun şəxsiyyəti barədə mənə bir tutarlı arayış verə bilərsinizmi?"

Bu o dövr idi ki, xalq N.Nərimanovun 100 illik yubile-yi-nin layiqincə qeyd edilməsini gözləyirdi. Lakin o vaxtlar bədnam qonşumuz ermənilər Moskvaya saysız-hesabsız məktublar - donos göndərir, N.Nərimanovu millətçi-likdə təqsirləndirirdilər. Bu səbəbdən də onun yubileyi gecikdirilirdi. Lakin Heydər Əliyevin cəsarətli addımları, dərin zəkası və uzaqgörənliyi qalib gəldi. Heydər Əliyevin göstərişi ilə arxivlərdən lazımi qədər materiallar, N.Nərimanovun tarixi xidmətlərini təsdiq edən sənədlər toplandı və Moskvaya göndərildi. N.Nərimanovun 100 illiyi ilə əlaqədar onun bu gün şəhərimizin yuxarı hissəsində ucaldılmış tunc heykəli Leninqradın (indiki Sankt-Peterburqun) zavodlarından birində hazırlanmışdı. Bildiyimə görə, bədnam və nankor qonşumuz olan erməni millətçiləri heykəlin əridilməsinə çalışırmışlar. Xoşbəxtlikdən Heydər Əliyev bu hadisədən xəbər tutmuş, heykəli zavodun həyətindən çıxarmağa müvəffəq olmuşdu. Beləliklə, Heydər Əliyevin böyük təşkilatçılığı ilə 1972-ci ildə N.Nərimanovun 100 illik yubileyi də qeyd olundu. Paytaxtımızda N.Nərimanov heykəli də ucaldıldı (potsamenti 2 metr aşağı salınmaqla olsa belə). Bu, Heydər Əliyev şəxsiyyətinin böyük qələbəsi idi. Yubileydə məruzə ilə Heydər Əliyev özü çıxış etdi. Sonralar Heydər Əliyevin təşəbbüsü ilə N.Nərimanovun heykəli keçmiş SSRİ-nin digər şəhərlərində də ucaldıldı. Bütün bunlar Heydər Əliyevin xalqımızın tarixi şəxsiy-yət-lərinə hörmətinin təzahürü kimi qiymətlidir və unudulmazdır.



Heydər Əliyevlə ikinci görüşüm yenə də onun APİ-yə gəlişi zamanı olub: 1973-cü il mart ayının 2-də, APİ-nin yaradılmasının 50 illik yubileyi günlərində. Yubiley indiki Şəhriyar adına Mədəniyyət Sarayında keçirildi. Heydər Əliyev bu ali təhsil ocağının yarım əsrlik inkişaf yolundan ətraflı bəhs etdi və Pedaqoji İnstitutun "Qırmızı Əmək Bayrağı" ordeni ilə təltif edilməsi haqqında SSRİ Ali Soveti Rəyasət Heyətinin fərmanını elan edərək ordeni institutun bayrağına sancdı. APİ-nin 50 illiyi ilə əlaqədar institutun bir qrup professor-müəllim heyətinə və əməkdaşlarına fəxri adlar verilməsi haqqında fərmanın Heydər Əliyev tərəfindən elan edilməsi kol-lek-tivimizin böyük ruh yüksəkliyinə səbəb oldu.

Ulu Öndərlə yaddaqalan digər görüşüm yenə də institutumuzun 60 illik yubiley tədbirinə təsadüf edib. 1981-ci ilin dekabr ayında keçirilən yubiley tədbirində Heydər Əliyevin şəxsən iştirak etməsi, böyük və yaddaqalan nitq söyləməsi, respublikamiz üçün yüksəkixtisaslı müəllim kadrları hazırlığında bu ali məktəbin xidmətlərinin yüksək qiymətləndirməsi bizləri hədsiz sevindirdi.

Ulu Öndər həmin nitqində demişdir: "60 il ərzində institutunuz şanlı yol keçmiş və Sovet Azərbaycanının gözəl nailiyyətlər qazanmasında böyük rol oynamışdır. Həmin dövrdə 65 min nəfərdən artıq ali təhsilli mütəxəssis hazırlanmışdır. İnstitutun yetirmələri indi respublika həyatının bütün sahələrində fəal işləyirlər. İnstitut tərəfindən hazırlanmış və indi xalq maarifi sahəsində çalışan mütəxəssislər 60 il ərzində respublikanın gənc nəslinin təlim və tərbiyəsi işinin əsas aparıcılarıdır. Eyni zamanda institutun yetişdirmələri elmi-tədqiqat institutlarında, müxtəlif müəssisələrdə, mədəniyyət sahəsində və başqa sahələrdə müvəffəqiyyətlə fəaliyyət göstərirlər. Demək olar respublikada elə bir guşə yoxdur ki, institutun diplomunu almış mütəxəssislər orada işləməsinlər. Sizin yetişdirmələriniz hər bir şəhərdə, hər bir kənddə yaşayır və çalışırlar, hər bir məktəbdə işləyirlər. Mənə elə gəlir ki, bu sizin 60 illik şanlı yolunuzun ən gözəl yekunudur.

İnstitutun 60 illik fəaliyyəti onu respublikanın həyatının bütün sahələrilə sıx bağlamışdır və bu gün böyük razılıq hissi ilə qeyd edə bilərik ki, V.İ.Lenin adına Pedaqoji İnstitut Sovet Azərbaycanında xalq maarifinin təşəkkülü və inkişafı üçün, respublikada ali təhsilin yaradılması və inkişafı üçün çox böyük iş görmüşdür və bu sahələrdə görkəmli yer tutur".

Heydər Əliyev daha sonra demişdir: "Ali məktəbinizin yubileyinin qeyd edilməsi respublikada ümumxalq bayramı olmuşdur. Bu yubileyi qeyd edərkən hər kəs öz şəxsi həyatında institutun rolunu böyük iftixar hissi ilə xatırlayır və qeyd edir. Buna görə də, bu gün mən respublikanın bütün əməkçilərinin ürək sözlərini ifadə edərək Azərbaycan Pedaqoji İnstitutunun kollektivinə respublika qarşısında böyük xidmətlərinə görə dərin təşəkkürümüzü və minnətdarlığımızı bildirirəm.

İnstitutda professor və müəllimlərin böyük kollektivi çalışır və altmış il ərzində bu kollektivdə bir neçə nəsil dəyişmişdir. Bu gün biz 20-ci illərdən bu günədək institutla birlikdə şanlı yol keçmiş, onun ölkədə ən böyük ali məktəblərindən birinə çevrilməsinə kömək etmiş bütün kollektiv üzvlərinə, xüsusən respublikada xalq maarifinin inkişafında xidmətlərinə görə minnət-darlığımızı bildirmək istəyirik".

Bu görüşdə yaddaqalan hadisələrdən biri bu oldu ki, Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 23 dekabr 1981-ci il tarixli fərmanı ilə elmin inkişafında, yüksəkixtisaslı elmi-pedaqoji kadr hazırlanmasındakı xidmətlərinə görə institutumuzun bir neçə əməkdaşı ilə bərabər mənə də "Azərbaycan SSR Əməkdar ali məktəb işçisi" fəxri adı verildi.

Heydər Əliyev həmin çıxışında ali məktəb işçiləri qarşısında qoyulan məsul vəzifələrdən bəhs etmiş, iqtisadiyyat və mədəniyyət sahəsində, eləcə də sosial problemlərin həllində müəllimlərin iştirakını xüsusi vurğulamışdır.

Müəllimlik işini şərəfli, həm də çətin iş hesab edən Heydər Əliyev belə hesab edirdi ki, "ali məktəb müəllimi olmaq, müəllimlər hazırlamaq, yəni müəllimlər müəllimi olmaq - ikiqat şərəfli və eyni zamanda ikiqat məsuliyyətli işdir. Biz yaxşı bilirik ki, 65 min nəfərdən artıq müəllim hazırlamaq üçün professor və müəllimlərin bütün nəsilləri nə qədər zəhmət çəkmişlər".

Ulu öndər Heydər Əliyevlə sonuncu, dördüncü görüşüm 1998-ci il sen-tyabr ayının 25-də Azərbaycan Müəllimlərinin I Qurultayında oldu. Müstəqil Azərbaycanın ilk müəllimlər qurultayı Respublika (indiki Heydər Əliyev) Sarayında keçirilirdi. Mən də qurultaya nümayəndə seçilmişdim. Dəvətnamədə göstərilən sıradakı yerimə yaxınlaşarkən Təhsil Nazirliyinin işçiləri məni başqa yerdə əyləşdirdilər. Ulu Öndər "Azərbaycan Respublikasının Prezidenti, zatialiləri möhtərəm Heydər Əliyev zala daxil olur!" sədaları altında əmək-daşların müşayiəti ilə mən oturduğum sırada əyləşdi. Onunla mənim aramda bir yer boş saxlanılmışdı. Bir neçə saat Prezidentlə bir sırada oturmaq nə qədər xoşbəxtlik imiş.

Bu görüşdə yaddaqalan hadisədən bəhs edəcəyəm. Qurultayda Təhsil Şurasının yaradılması barədə qərar qəbul edilməsi müzakirə olunurdu. Şuranın tərkibinə bir qayda olaraq vəzifəli şəxslərin seçilməsi təklifi səslənirdi. Bu dəfə də elə oldu. Ancaq Heydər Əliyev gözlənilmədən bu təklifləri rədd etdi və Şuranın tərkibinə müəllimləri, maarif işçilərinin seçilməsini məqsədəuyğun hesab etdi.

Heydər Əliyev dedi: "Görürsünüz ki, nümayəndə olmasam da, sizin qurultayınızda fəal iştirak edirəm. Hətta Təhsil Şurası haqqında siyahı oxunanda yalnız mən təşəbbüs göstərdim. Amma gördüm ki, buraxılmış həmin səhvi siz də görmüşdünüz, ancaq nədənsə, bunu demədiniz. Bəlkə də mən deməsəm, siz deyəcəkdiniz. Bu barədə öz fikrimi izah etmək istəyirəm. Mən belə anladım ki, qurultayda yaradılan Təhsil Şurası ictimai təşkilatdır. Ona görə də, belə bir təşkilatda yalnız müəllimlər, bilavasitə təhsil sahəsində işləyənlər, bilavasitə təhsillə məşğul olanlar olmalıdırlar. Belə bir Şuraya hökumət üzvlərini və Prezident Aparatının bir çox məsul vəzifəli şəxsləri, başqa vəzifəli şəxsləri, hətta Daxili işlər nazirini, Müdafiə nazirini və Baş prokuroru salmaqla bu Şuranın tamamilə mənasını dəyişirsiniz. Əksinə, mən hesab edirəm ki, bu Şuranın müstəqil olması üçün orada dövlət nümayəndələri olmamalıdır. Gərək bu Şura müstəqil olsun, ictimai təşkilat olsun, öz sözünü hökumətə, hakimiyyət orqanlarına desin və öz təkliflərini irəli sürsün. Şurada nazirlərin olması sizə lazım deyildir. Mən isə söz verirəm ki, hər bir nazirin, hökumət nümayəndəsinin sizin Şuranın bütün təkliflərinə, qərarlarına baxmasını təmin edəcəyəm. Ona görə də Şuranın tərkibində onların olmasına ehtiyac yoxdur. Güman edirəm ki, Şuranın tərkibi sizin də, mənim də düşün-düyümüz kimi olacaqdır. Azərbaycanın Prezidenti kimi mənim tərəfimdən isə bu Şura həmişə dəstək ala biləcəkdir".

Ulu Öndərin təklifi gurultulu alqışlarla qarşılandı. Pedaqoji elmlər doktoru, professor Əjdər Ağayev Təhsil Şurasının sədri seçildi.

(Davamı 4-cü səhifədə)

## Ümummilli lider Heydər Əliyev - 90

# TƏHSİLİMİZİN KEŞİYİNDƏ

(Əvvəli 3-cü səhifədə)

Qurultayda Heydər Əliyev böyük nitq söylədi, qurultayın sərbəst, tam demokratik şəraitdə geniş və gözəl müzakirə, fikir mübadiləsi şəraitində keçdiyini xüsusi vurğuladı və bundan çox sevindiyini bildirdi.

Heydər Əliyev müstəqil Azərbaycanın I Müəllimlər Qurultayını ölkəmizdə təhsilin gələcəyi və ümumiyyətlə, Azərbaycanın gələcəyi üçün mühüm bir mərhələ kimi dəyərləndirərək dedi: “Bizim və sizin - hamımızın vəzifəmiz ondan ibarətdir ki, bu qurultayda irəli sürülmüş fikirlər, təkliflər həyata keçirilsin və Azərbaycanda bütün təhsil daha da yüksəlsin”.

Heydər Əliyev belə hesab edirdi ki, indiyə qədər yaranmış təməlin, əsasın üzərində Azərbaycanın təhsili, məktəbi bundan sonra daha da təkmilləşəcək, inkişaf edəcək və Azərbaycan uşaqları, gəncləri bu inkişaf dövrümüzdə ilbəil daha da geniş, yüksək təhsil alacaqlar.

“Bizim bugünkü qurultayımızın məqsədi, mənası məhz bundan ibarətdir. Bu gün mən sizinlə birlikdə müstəqil Azərbaycan Respublikasının ilk müəllimlər qurultayında olmağımı özüm üçün böyük xoşbəxtlik hesab edirəm” - deyirdi.

Heydər Əliyev müəllimlik peşəsini yüksək qiymətləndirirdi. Xüsusi vurğulayırdı ki, XX əsri sona çatdırdığımız, XXI əsrə doğru getdiyimiz bir zamanda mən bəyan edirəm: Müəllimlik peşəsi ən yüksək qiymətə layiq olan peşədir. Bizim müstəqil respublikamızda, Azərbaycan cəmiyyətində müəllim bu gün də, gələcəkdə də ən hörmətli insan kimi qəbul edilməlidir. Həyatını müəllimliyə həsr edən insanlar həqiqətən, fədakar, xalqına, millətinə sədaqətli və eyni zamanda qəhrəmanlıq göstərən insanlardır. Müəllimlik peşəsi asan peşə deyil. Bəziləri hesab edirlər ki, hər adam müəllim ola bilər. Bəzən olur ki, müəllimliyə layiq olmayan adam da müəllimlik edir. Belə hallar bu gün də var, gələcəkdə də ola bilər. Ancaq Azərbaycan müəllimlərinin tam əksəriyyəti layiqli müəllimdir. Əgər bunlar belə olmasaydı, Azərbaycanın bugünkü elmi, iqtisadiyyatı, mədəniyyəti, yüksəlişi ola bilərdimi? Biz bunların hamısını məktəblərdən, universitetlərdən, müəllimlərdən - Sizdən almışıq”.

Heydər Əliyev özünün şəxsi həyatında müəllimi ən ali sima hesab edirdi.

Təhsilin hər bir dövlətin, ölkənin, cəmiyyətin həyatının mühüm sahəsi olduğunu, xalqın, millətin intellektual səviyyəsini əks etdirən xüsusi sfera olduğunu dərindən bilən Heydər Əliyev Azərbaycanda təhsilin inkişafına qayğını ön plana çəkir, ölkənin sosial-iqtisadi inkişafında aparıcı istiqamətlərdən biri kimi təhsilin ölkənin yeni quruculuq tələblərinə uyğun yeniləşməsinə geniş meydan verirdi. Azərbaycan təhsil sisteminin müxtəlif inkişaf mərhələlərində özünəməxsus xüsusiyyətlərini təhlil edən Heydər Əliyev onun yeni təhsil strategiyasını hazırladı. Azərbaycan təhsilinin son 40 illik tarixi inkişafının təhlili göstərir ki, Azərbaycan təhsilinin milli tariximizdə coşğun yüksəliş mərhələsi Heydər Əliyevin adı ilə bağlı olmuş-dur. Keçmiş SSRİ-nin ali rəhbərliyində calışdığı 1982-1987-ci illərdə bir sıra sahələrlə yanaşı, SSRİ kimi superdövlətin bütövlükdə təhsil sisteminə - Ali Təhsil Nazirliyi, Maarif Nazirliyi və Texniki Peşə Təhsili Komitəsinə - rəhbərlik etmişdi. Onu da qeyd edim ki, 1984-cü ildə SSRİ-də həyata kecirilən məktəb islahatı komissiyasına Heydər Əliyev rəhbərlik etmişdir. Heydər Əliyev böyük həvəslə o illəri xatırlayaraq deyirdi: “Mən butun həyatım boyu məktəblə, təhsil sistemi ilə bağlı olmuşam. 1969-cu ilə qədər bir çox dövlət işlərində işlədiyim zaman mən daim məktəbə, ali məktəblərə maraq göstərmişəm və onların fəaliyyətində müəyyən xidmətlərim olubdur. Ancaq mən 1969-cu ildə respublikanın rəhbəri seçiləndən sonrakı fəaliyyətimin, şübhəsiz ki, bütün sahələrini qiymətləndirərək Azərbaycanda məktəbin, orta, ali təhsilin, texniki peşə təhsilinin inkişaf etməsini öz fəaliyyətimin əsas hissəsi hesab etmişəm, bununla ciddi məşğul olmuşam. Bu gün iftixar hissi kecirə bilərəm ki, o illər, mən Azərbaycana rəhbərlik etdiyim zaman saysız-hesabsız məktəblər yaranıbdır, ali məktəblərin sayı, onların fakultələri, kafedraları artıbdı, yüksək səviyyəli müəllim kadrları, univesitetlərdə dərs deyən alim kadrları hazırlanıbdır və bunların hamısında mənim xidmətlərim olubdur”.

O vaxtlar məktəb islahatını hazırlamaq üçün müəxəssislər, ən cox isə SSRİ PEA-nın təcrubəli əməkdaşları səfərbər edilmişdilər. Onlar Moskva yaxınlığındakı hökumət istirahət evlərindən yaşayır və islahatın layihəsi üzərində işləyirdilər. Onların arasında mənim yaxşı ünsiyyətdə olduğum, Yeltsinin hakimiyyəti dövründə Rusyanın təhsil naziri olmuş E.D.Dneprov da var idi. Sonralar söhbətlərinin birində həmin dövrü xatırlayan E.D.Dneprov deyirdi ki, bizlər bütün günü layihə üzərində işləyirdik, lakin axşamlar Heydər Əliyev gəlib bizim yazdıqlarımızı redaktə edərdi.

Başqa misal: məlum olduğu kimi, Sovetlər Birliyi dövründə L.İ.Brejnevin bir “fəal həyat mövqeyi” adlı bir fikri geniş əks-səda doğurmuşdu. Ölkədə bu mövzu ilə bağlı tədbirlər keçirilmiş, mətbuatda çoxlu məqalələr dərc edilmişdi. Azərbaycanda da bu sahədə iş aparıldı, ən başlıcası isə böyük tərkibdə bir respublika konfransı çağırıldı. Konfransa Moskvadan nümayəndə qismində o vaxtlar MK-da şöbə müdiri işləyən Tyajelnikov dəvət olunmuşdu. Konfransda girin sözünü respublika rəhbəri kimi Heydər Əliyev söylədi. Heydər Əliyevdən sonra Tyajelnikov məruzə etməli idi. Lakin Heydər Əliyevin məruzəsi o qədər dolğun və məzmunlu olmuşdu ki, Tyajelnikov kimi natiq insan öz çıxışından imtina etmişdi. Bu sətirlərin müəllifi olan mən həmin faktın Moskvada geniş əks-səda doğurduğunun şahidi olmuşam.

* * *

Heydər Əliyevin həyat yolu və fəaliyyəti Azərbaycan dövlətinə, Azərbaycan xalqına Ulu Tanrının böyük töhfələrindən biridir. O, Azərbaycan təhsilinin üstün inkişafı, ölkənin kadr, intellektual potensialının möhkəmləndirilməsi üçün möhtəşəm bir təməl, özül yaradıb, mütərəqqi, ümummilli ənənələr formalaşdırıb. Bu gün Heydər Əliyevin ideyaları, əməlləri Ulu Öndərin müdrik siyasi kursunun layiqçisi davamçısı olan Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirilir.

**Hüseyn ƏHMƏDOV,**
**Ümumi pedaqogika kafedrasının müdiri, pedaqogika üzrə elmlər doktoru, professor, SSRİ PEA-nın müxbir üzvü, Rusiya Dövlət Təhsil Akademiyasının xarici üzvü və “Qızıl medal”ının laureatı**

# HEYDƏR ƏLİYEV - TARİX YARADAN ŞƏXSİYYƏT

Tarix öz kökünə, keçmişinə qırılmaz tellərlə bağlı olan az şəxsiyyətlər yetirməyib. Böyük yaradanın XXI əsrdə Azərbaycana bəxş etmiş olduğu fövqəlzəka sahiblərindən biri və birincisi, “Azərbaycan xalqının ümummilli lideri” “ulu öndər” kimi böyük adlara əbədi sahib olmuş Heydər Əlirza oğlu Əliyevdir.

Dünya, bəşər - dünya xəritəsində kiçicik ölçüdə yaşadılan 9 milyonluq bir xalqın övladını hansı fövqəlməziyyətlərinə görə belə sevir, qəbul edir, onunla hesablaşırdı?

Bu sorğuları hər hansı məqam üçün cavablandıra bilmək ehtimalının hər biri bir kitab, bir dastan həcmində.

Müstəqil dövlət kimi tanınmağa yenicə səy göstərən, daxili ziddiyyətləri vətəndaş müharibəsi həddinə çatan, eyni zamanda xarici müdaxilənin təhdidi ilə üz-üzə duran bir ölkəyə rəhbərlik 1993-cü ildə xalqın inadlı tələbi ilə ulu öndər Heydər Əliyevə həvalə olundu. O isə bütün bu sədləri, tərəddüdləri, şüurların qəbul etməyə çətinlik çəkdiyi düşüncələri darmadağın etdi. Dünyagörüşünün, təfəkkürünün, fövqəlzəkasının gücünə bel bağlayıb Azərbaycanın dövlətçilik ənənəsinin bünövrəsini qoyaraq məhz Heydər Əliyev siyasi məktəbini yaratdı, başının tacı bildiyi Azərbaycanını ayağa qaldırdı, dirçəltdi. Məhz Heydər Əliyevin fəaliyyətinin nəticəsi olaraq Azərbaycan özünün strateji, iqtisadi və mədəni potensialından səmərəli istifadə edərək Şərqlə Qərb arasında etibarlı körpü rolunu oynamağa başladı, dünyanın dinamik inkişaf edən dövlətlərindən birinə çevrildi.

Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, akademik Ramiz Mehdiyev “Əsl vətəndaş, böyük şəxsiyyət və qüdrətli lider haqqında bəzi düşüncələr” adlı əsərində yazır: “1969-cu il Azərbaycanın ən yeni dövrü tarixində dönüş ili oldu. Respublikanın dinamik inkişafının təmin edilməsinə dair kompleks proqramlar işlənib hazırlandı. Bu yorulmaz fəaliyyət sayəsində 1970-1985-ci illər baş vermiş dəyişikliklərin vüsəti, rifahın keyfiyyətcə yeni səviyyəyə yüksəlməsi baxımından sözün tam mənasında müstəqil Azərbaycanın yaranması salnaməsində ən parlaq səhifədir. Həmin illərdə Heydər Əliyevin təşəbbüsü ilə SSRİ hökuməti respublika iqtisadiyyatının hərtərəfli tərəqqisi və intensiv inkişafını nəzərdə tutan beş xüsusi qərar qəbul etmişdi. Sosial-iqtisadi inkişafın başlıca istiqamətlərini müəyyən edən həmin qərarların xalqımızın mənafeləri baxımından tarixi əhəmiyyəti vardı. Tam inamla demək lazımdır ki, indiki mərhələdə Azərbaycanın dövlət suverenliyi və iqtisadi müstəqilliyi, onun xarici iqtisadi əlaqələrinin müntəzəm surətdə genişlənməsi və dünya iqtisadiyyatına daha dərin inteqrasiyası prosesi hələ 1970-ci illərdə, 1980-ci illərin əvvəllərində təməli qoyulmuş potensiala əsaslanır”.

Heydər Əliyev bu idi - potensial fövqəlzəkaya, bu zəkanın ona diktə etdiklərini hasilə yetirmək qüdrətində olan tükənməz enerjiyə və təşkilatçılıq qabiliyyətinə malik insan! O, bu şəxsi qabiliyyətlərinin məcmusunu Azərbaycanın təbii ehtiyatları və iqtisadi potensialı ilə birləşdirib onlardan imkan daxilində maksimum səmərəli bəhrələnməklə mövcud reallıqları düzgün istiqamətləndirərək respublikamızın sürətli inkişafına və təkanlı yüksəlişinə müvəffəq oldu. Heydər Əliyevin Azərbaycanda birinci dəfə siyasi hakimiyyətdə olduğu 13 illik bir dövrdə ondan Azərbaycanın tarixinə yazılı hansı yadigarlar qaldı. Faktlara istinadən görürük ki, 1970-1982-ci illərdə respublikada 250 yeni müəssisə, istehsalat və sex tikilmiş, neftayırma sənayesi müəssisələri yenidən qurulmuş, iri elektron, elektrotexnika, radiotexnika, cihazqayırma sənayesi üçün zavodlar inşa edilmişdi. XX əsrin birinci 50 ili ilə müqayisədə ölkədə sənaye istehsalı 2,7 dəfə artmış, başqa sözlə, 101,5 milyard manatlıq (o zamankı pul vahidi ilə) məhsul istehsal edilmişdi. Bu illər ərzində xalq istehlakı malları istehsalının 3 dəfə, əmək məhsuldarlığının 2 dəfədən çox, fondveriminin 25 faiz artması faktları da xüsusi diqqət çəkir. Respublika paytaxtında yeni mikrorayonların, park və xiyabanların, küçə və meydanların salındığını və bunların sayəsində Bakının keçmiş SSRİ-nin sayılıb-seçilən şəhərlərindən birinə çevrildiyini, N.Nərimanova, H.Cavidə, C.Cabbarlıya, İ.Nəsimiyə və respublikamızın bir çox görkəmli xadimlərinə heykəllər ucaldılmasını, bütün keçmiş SSRİ-yə səs salmış Bakı Məişət Kondisionerləri zavodunun, Respublika (indiki Heydər Əliyev sarayının) və Gülüstan sarayının və digər nəhəng binaların inşaası faktlarını da bura əlavə etsək, gözlərimiz önündə ölkənin hansı inkişaf mərhələsini adladığının böyük bir panoramı açılar.

Nəticə isə zaman-zaman xatırlanacaq bir adla - Azərbaycan KP MK-nın I katibi Heydər Əliyevin keçmiş SSRİ-nin ən ali mükafatı olan Sosialist Əməyi Qəhrəmanı adına layiq görülməsi ilə Azərbaycanın tarixində qızılı hərflərlə əbədi yazılı qaldı.

Həm də yalnız bunlarlamı?

Ulu Öndərin hələ XX əsrin 70-80-ci illərində doğma Azərbaycanı üçün etdikləri sırasında gerçək nəticələrini Azərbaycanımızın müstəqillik əldə edəndən sonrakı zaman civarında gördüyümüz təhsil siyasətindən söz açmamaq olmaz. Həmin dövr həm də Azərbaycan təhsilinin intibah dövrü hesab edilir.

Azərbaycan təhsilinin XX əsrin II yarısından sonrakı inkişafını dörd mərhələyə bölmək mümkündür: Birinci mərhələ - 1970-1982-ci illər (Heydər Əliyevin Azərbaycana siyasi rəhbərliyinin I dövrü), ikinci mərhələ - 1982-1987-ci illər (Heydər Əliyevin keçmiş SSRİ dövlətində Sov.İKP MK-nın büro üzvü və SSRİ Nazirlər Sovetinin I müavini vəzifəsində çalışdığı illər), III mərhələ - 1988-1993-cü illər, ölkənin parçalanma təhlükəsi ilə göz-gözə qaldığı zaman kəsiyində Azərbaycan təhsilinin tənəzzül dövrü və IV mərhələ - 1993-2003-cü illər. Hansı ki, bu dövr Azərbaycan təhsilində yeni milli təhsil quruculuğu dövrü adlandırılır.

(Davamı 5-ci səhifədə)

## Ümummilli lider Heydər Əliyev - 90

# HEYDƏR ƏLİYEV - TARİX YARADAN ŞƏXSİYYƏT



(Əvvəli 4-cü səhifədə)

Ulu Öndərin respublikamızda siyasi hakimiyyətdə olduğu 1969-1982-ci illərdə məktəbəqədər tərbiyə müəssisələrinin sayı 1600-dən 1875-ə çatmış, Azərbaycanın şəhər, kənd və qəsəbələrində 700-ə qədər yeni məktəb binası tikilib istifadəyə verilmişdi. Onun şəxsi təşəbbüsü və təşkilatçılığı ilə həmin illərdə 5 yeni ali təhsil müəssisəsi yaradılmış, ali məktəb tələbələrinin sayı 70 mindən 100 min nəfərə çatdırılmışdı. Bunu da qeyd etməyimiz vacibdir ki, Ulu Öndər istedadlı azərbaycanlı gənclərin keçmiş SSRİ-nin qabaqcıl və nüfuzlu ali təhsil ocaqlarında təhsil almalarına da xüsusi diqqət yetirirdi. 1969-cu il üçün həmin rəqəm 47 idisə, məhz Ulu Öndərin şəxsi təşəbbüsü sayəsində həmin göstərici ötən əsrin 80-ci illərinin əvvəllərində hər il üçün 1000-1400 nəfərə çatmışdı. Bu, keçmiş SSRİ-nin 50-dən artıq şəhərinin 170-dən çox nüfuzlu ali məktəbində (məsələn, M.V.Lomonosov adına MDU, Moskva Energetika İnstitutu, Mendeleyev adına Moskva Kimya Texnologiyaları İnstitutu və s.) xalq təsərrüfatının, elm, təhsil və mədəniyyətin 80-dən artıq sahəsini əhatə edən və ən zəruri ehtiyac duyulan 250-dən çox yüksəkixtisaslı kadrların hazırlanması demək idi. Ulu Öndərin uzaqgörən siyasətinin bu mərhələsi azərbaycanlı hərbi kadrların yetişdirilməsi problemini də əhatə edirdi. Hansı ki, təkcə 1982-ci ildə keçmiş Sovetlər Birliyinin ali hərbi məktəblərinə 550 nəfər azərbaycanlı gənc qəbul edilmişdi

Ulu Öndər Azərbaycan gəncliyinin sadəcə respublikadan kənarda təhsil alması kimi mövqe ilə kifayətlənmirdi. O, şəxsən özü gənclərlə görüşür, onlara məsləhət və tövsiyələrini verirdi. Bu, gənclik üçün böyük bir stimul idi. Gənclik görəndə ki, dövlət başçısı onların ali təhsil almaları ilə şəxsən maraqlanır, təhsillərini başa çatdırandan sonra işlə təmin olunmalarının qayğısına qalır, təbii olaraq bu qayğıya və diqqətə özündə qarşılıqlı məsuliyyət hiss edir, digər respublikalarda Azərbaycanın adını, şərəfini layiqincə qorumağa borclu olduqlarını dərk edirdilər.

***Yeri gəlmişkən:***

***Azərbaycanlı gənclərin xaricdə təhsil sahəsindəki bu uzaqgörən siyasət müasir dövrümüzdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev tərəfindən uğurla davam etdirir. Belə ki, «2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» çərçivəsində 5 min nəfər azərbaycanlı gəncin xaricdə ölkəmiz üçün vacib olan ixtisaslar üzrə təhsil alması nəzərdə tutulur.***

Ulu Öndərin keçmiş SSRİ-nin ali hərbi məktəblərində azərbaycanlı hərbi kadrlar hazırlanmasına, həmçinin respublikamızda C.Naxçıvanski adına Hərbi Liseyin və APİ-də (indiki ADPU) "İbtidai hərbi hazırlıq və fiziki tərbiyə" fakültəsinin yaradılmasına istiqamətlənmiş müdrik, uzaqgörən siyasəti nəticə etibarilə bu gün Azərbaycan Silahlı Qüvvələrinin Cənubi Qafqazda aparıcı qüvvəyə çevrilməsinə gətirib çıxarmışdır.

Deməliyəm ki, Azərbaycan Dövlət Pedaqoji İnstitutunda «İbtidai hərbi hazırlıq və fiziki tərbiyə» fakültəsinin yaradılması hələ 1978-ci ildə, SSRİ Təhsil Nazirliyi Elmi-Metodik Şurasının yığıncağında qərara alınmışdı. Adıçəkilən fakültə SSRİ Müdafiə və Təhsil nazirliklərinin birgə təqdimatı əsasında SSRİ Nazirlər Sovetinin sədri Aleksey Nikolayeviç Kosıginin imzaladığı sərəncamla yaradılırdı. Hansı ki, SSRİ-də dördüncü, Zaqafqaziyada isə birinci və yeni ixtisas idi. Fakültənin təşkili ulu öndər Heydər Əliyevin ciddi səyi nəticəsində başa gəlmişdi.

Fakültənin yaradılması 1981-ci ildə baş tutdu. Fakültə leytenant rütbəsi ilə respublikanın ümumtəhsil məktəbləri üçün ildə 200 nəfərə qədər ibtidai hərbi hazırlıq müəllimi hazırlayırdı. Hansı ki, ölkəmiz dövlət müstəqilliyini bərpa edəndə onların hər biri taqım komandiri kimi yeni formalaşmağa başlayan milli ordumuzun ilk zabitləri oldular.

1992-ci ilin fevralında tələbələrimizin Qəbələ rayonundakı turizm bazasında Ayxan adlı bir türk zabitinin rəhbərliyi ilə ciddi hərbi təlim-məşqlər keçdiklərini yaxşı xatırlayıram. Təlim-məşqlər 3 aya qədər davam etdi. Sonra tələbələrimizdən bir qismi təhsil almaq üçün universitetə döndü, təhsilini başa çatdıranlar isə Vətən torpaqlarını müdafəsinə yollandı. Onlar 1992-ci ilin may ayında Füzuli, Cəbrayıl, Şuşa, Laçın uğrunda gedən döyüşlərə qatıldılar. Təhsillərini davam etdirmək üçün universitetə dönən tələbələr də diplom alandan sonra Laçın, Şuşa, Füzuli, Qubadlı cəbhələrinə yollandılar.

ADPU-nun «İbtidai hərbi hazırlıq və fiziki tərbiyə» fakültəsinin məzun və tələbələrindən Qarabağ müharibə-sində həlak olanların sayı 30 nəfərdir. Ancaq əksəriyyəti işğal olunmuş rayonlardan olduğundan təəssüf ki, onların yalnız 16 nəfəri haqqında məlumat toplamaq mümkün olmuşdur.

Şəhid məzunlarımızdan M.M.İbrahimov (1959-1992-ci il), M.Quliyev (1952-1992), A.M.Rzayev, M.Y.Bayramov (1964-1990), M.A.Məmmədov (1959-1994), H.H.Ələkbərov (1968-1992), İ.N.Salıfov (1967-1992), N.T.Qasımov (1961-1992), S.S.Abbasov (1966-1992), V.M.İsmayılov (1968-1993), İ.M.Əsədov (1967-1992), E.Ə.Qədirov (1961-1994), E.A.-Hüseynov (1972-1992), İ.D.İsmayılov (1967-1995), V.F.Bünyadov və M.Kərimovun adlarını iftixarla çəkmək olar. Ölkəmizin ərazi bütövlüyünün qorunmasında, Vətən torpaqlarının erməni işğalçılarından müdafiəsi uğrunda gedən döyüşlərdə göstərdikləri şəxsi igidlik və şücaətə görə ölümlərindən sonra alay komandiri, leytenant Mətləb Quliyevə və kapitan Mirələkbər İbrahimova "Azərbaycanın Milli Qəhrəmanı" fəxri adı verilmişdir. A.M.Rzayev, M.Y.Bayramov və M.A.Məmmədov isə "Azərbaycan Bayrağı" ordeninə layiq görülmüşlər.

Fakültənin məzunu, ehtiyatda olan polkovnik-leytenant, baş müəllim Şikar Şikarov Silahlı Qüvvələrin "Yubiley" medalı ilə təltif edilib. Ehtiyatda olan kapitan, baş müəllim Natiq Əliyev 1993-cü ilin oktyabr ayında ordu sıralarına çağırılaraq Qarabağ uğrunda gedən döyüşlərin birində yaralanmış, müalicə aldıqdan sonra xidmətini arxa cəbhədə davam etdirmişdir.

Hazırda respublikamızda elə hərbi hissə, yaxud bölmə olmaz ki, orada zabit heyətinin tərkibində haqqında bəhs etdiyimiz fakültənin və C.Naxçıvanski adına Hərbi Liseyin məzunlarından olmasın.

* * *

***"Mən harada olsam, necə yaşasam da, ürəyim Azərbaycanla bir vurur - istər Moskvada yüksək səviyyədə yaşayım, istər Naxçıvanda kiçik bir daxmada".***

**Heydər ƏLİYEV**

Yaşından, mövqeyindən, səlahiyyət dairəsindən asılı olmayaraq, bütün zamanlarda Azərbaycan xalqı Heydər Əliyevin sözünün ağası olduğunu şahidi oldu. İstər Moskvadakı Azərbaycan nümayəndəliyində totalitar rejimin Azərbaycan xalqına qarşı işğalçı mövqeyinə qarşı üsyan səsini ucaldanda, istər Sov.İKP-nin üzvü olduğunu təsdiq edən partiya biletini atanda, istər Naxçıvanda Yeni Azərbaycan Partiyasının yaradıcısı kimi fəaliyyət proqramını irəli sürəndə, istərsə də Azərbaycanda siyasi hakimiyyətə gəldiyi və bu hakimiyyətdə olduğu bütün illər ərzində.

1993-cü il iyunun 15-də AR Ali Sovetinin sədri seçilən zaman Ulu Öndərin həmin iclasdakı çıxışında dediklərini xatırlayaq: "Sizi əmin edirəm ki bütün imkanlardan istifadə edib bu böyük vəzifəni, ağır bir yükü aparmağa çalışacağam və bu vəzifənin ləyaqətlə yerinə yetirilməsinə səy edəcəyəm. Bildirmək istəyirəm ki, Azərbaycan Respublikasının bugünkü ağır, mürəkkəb və gərgin vəziyyətini tam məsuliyyətlə dərk edirəm. Bu vəzifəni üzərimə götürərək öz məsuliyyətimi anlayıram və bunların hamısını rəhbər tutaraq əlimdən gələni edəcəyəm".

Və etdi də. Hansı ki, bu keçilən yol haqqında cild-cild kitablar yazılıb, hələ nə qədər illər sonra da nə qədər tədqiqatçılar tərəfindən Heydər Əliyevin XX əsrin sonuncu onilliyində Azərbaycan xalqı, Azərbaycan dövləti üçün etdikləri öyrəniləcək, cild-cild kitablara çevrilib gələcək nəsillərə çatdırılacaq. Bu sırada nələr durmur? - Ölkə daxilində vətəndaş müharibəsi həddinə çatmış daxili gərginlik, xarici müdaxilənin Azərbaycana təhdid etməsi, Azərbaycanın bölgələrə parçalanma ehtimalı, AXC-Musafat cütlüyünün iqtidarda olduğu təqribən bir il ərzində respublikamızın uçuruma yuvarlanma həddində olması və sonucda Heydər Əliyevin bütün bu labüd fəlakətlərdən ölkəni xilas etməsi faktı. Hansı ki, Azərbaycan övladları XX əsrin sonuncu onilliyinin fövqəlzəka sahibi Heydər Əliyevin sayəsində özünün müstəqillik və suverenlik arzularının əbədi gerçəkləşməsinin tarixi kimi əsrlər boyu yaddaşlarda yaşadacaq. Azərbaycan Prezidenti İlham Əliyevin sözləri ilə desək, "Heydər Əliyev 1993-cü ildə parlamentin sədri seçildikdən sonra müstəqil Azərbaycanın həyatında yeni dövr başlanmışdır. Əgər 1993-cü ildə xalqın tələbi və təkidi ilə Heydər Əliyev hakimiyyətə gəlməsəydi, Azərbaycan çox böyük bəlalarla üzləşə bilərdi. Bu gün həmin dövrü təhlil edəndə görürük ki, Heydər Əliyevin qətiyyəti, cəsarəti, iradəsi Azərbaycanı bu bəlalardan qurtardı. Heydər Əliyev xalqının müdrikliyinə, gücünə inanırdı. O bilirdi ki, xalq onu dəstəkləyir, onun arxasınca gedir. Əgər belə olmasaydı, 1993-cü ildə o, Bakıya qayıdıb bu vəziyyətdən çıxış yolları tapa bilməzdi. Heydər Əliyev xalqın gücünə arxalanaraq bütün tədbirləri həyata keçirdi və on il ərzində Azərbaycan müasir, iqtisadi cəhətdən qüdrətli dövlətə çevrildi. İndi Azərbaycanla hesablaşır, Azərbaycana hörmət edirlər. Ölkəmiz dünya birliyində özünəlayiq yerini tuta bilibdir. Onun ideyaları yaşayır. Onun siyasətini davam etdirmək üçün əlimizdən gələni edəcəyik".

Bu gün bu yol Ulu Öndərin ən layiqli varisi cənab İlham Əliyev tərəfindən ləyaqət və müvəffəqiyyətlə davam etdirilir. Bu gün respublikamızda əldə edilən bütün uğurlar Ulu Öndərin müdrik siyasətinin bəhrəsi, Azərbaycan Prezidenti İlham Əliyevin müstəsna xidmətlərinin nəticəsidir.

**Ədalət FƏRƏCOV,**
**İnsan və heyvan fiziologiyası kafedrasının müdiri,**
**professor,**
**Prezident təqaüdçüsü**

# AQAC-ın universitet bölməsi fəaliyyətini genişləndirir



Ötən sayımızda "Hər birimizin vətəndaşlıq borcu" sərlövhəli yazıda Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU bölməsi üzvlərinin fevral ayının 7-8-də universitetin pensiyada olan üç müəllimini - Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının baş müəllimi Nahidə Əfəndiyevanı, Mülki müdafiə və ibtidai biliklərin əsasları kafedrasının baş müəllimi Firəngiz Rəhimovanı, həmçinin Kimya fakültəsində öncə baş laborant, sonra isə uzun illər laboratoriya müdiri işləmiş Şəfiqə Eldarovanı ziyarət etdiklərindən, onlara AQAC tərəfindən pul və hədiyyələr verildiyindən söz açmışdıq. AQAC-ın universitet bölməsinin sədri, professor Jalə Qədimova, sədr müavini, müəllim İradə Qasımova, üzvlərdən dosent Elmira Əfəndiyeva, baş müəllimlər Kəmalə İsmayılova, Firəngiz Hidayətova, Arifə Qəribova, Rəfiqə Kərimova, Qəribə Rəhimova, Qaçay Əliyev, tyütorlar Səkinə Əsədova, Nərmin Qənbərova və Pedaqoji fakültənin IV kurs tələbəsi Sara Əjdərova bu dəfə mart ayının 14-də Bilgəhdə Müharibə və Əmək Əlilləri üçün Pansionatda olublar. Pansionatın sakinləri üçün AQAC-ın üzvlərinin şəxsi vəsaitləri hesabına 20 kiloqram ət, 200 ədəd badambura, 200 ədəd şorqoğal, şirniyyat və s. aparmışdılar.





Direktor Bəhruz Əlmədətovun verdiyi məlumata görə, pansionat 1964-cü ildə istifadəyə verilib. Sakinlər bura rayon əhalinin sosial müdafiə mərkəzlərinin göndərişi əsasında qəbul edirlər. Hazırda pansionatda 160 nəfər yaşayır. Onlar tam dövlət təminatındadırlar. Klub, kitabxana, oyun otağı, akt zalı sakinlərin ixtiyarına verilib. Həyətdə kifayət qədər kölgəlik var.

Sakinlərlə görüşdük, kitabxanada, klubda, otaqlarda olduq. 1928-ci il təvəllüdlü Sapunov Georgiy Petroviç 31 ildir ki, burada yaşayır. Kitabxananın bütün işləri ona həvalə olunub. Deyir ki, hər gün səhər yeməyindən sonra kitabxananı açır, axı pansionatın sakinlərini kitab, qəzet və jurnallarla təmin etmək onun öhdəsindədir. G.Sapunov cavan yaşlarında bayan ifaçısı olub. İndi də bu peşəsini yadırğamayıb. Kitabxanaya gələn qonaqlar, yaxud sakinlər üçün hərdən bu musiqi alətini səsləndirməyi də unutmur. Onların yaşayış tərzi ilə maraqlanan tanınmış simaların fotoları toplanmış albom da hazırlayıb. Bu albomda kimləri görməzsiniz: respublikanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili, YUNESKO-nun və İSESKO-nun xoşməramlı Mehriban Əliyeva, Qafqaz Müsəlmanları İdarəsinin sədri, Şeyxülislam Allahşükür Paşazadə, millət vəkili Qənirə Paşayeva, tanınmış müğənnilər, aktyorlar...

G.Sapunov Heydər Əliyev Fondundan ona 3 fotoaparat hədiyyə edildiyini söylədi.

65, 67, 69 saylı otaqlarda və eləcə də digər otaqlarda olaraq sakinlərlə görüşdük. Sakinlər pansionatın direktoru Bəhruz Əlmədətovdan çox razılıq edirlər. Bütün otaqlar televizor, soyuducu, dolab, sanitar qovşağı ilə təmin olunub. Sakinlərin dili ilə desək, burada öz evlərindəki kimi yaşayırlar, dövlət təminatı bir yandan, pensiyaları da öz yerində.

Pansionatda tanış olub ailə quranlar da var. 1939-cu il təvəllüdlü Səfiquluyev Muxtadir Mircavadoviç və 1938-ci il təvəllüdlü Zinaida Mixaylovna 4-5 ildir ki, özlərinin yeni həyatını yaşayırlar.

Pansionatın sakinləri gəlişimizə çox sevindilər, hədiyyələrimizi məmnuniyyətlə qəbul etdilər. AQAC-ın üzvü olan IV kurs tələbəsi Sara Əjdərovanın ifası onlar tərəfindən dəfələrlə alqışlarla qarşılandı. AQAC üzvlərinə qoşulub rəqs edənlər, Novruz şənliyinin şirinliyini yaşayanlar da oldu.

Pansionatda yaşayan Yaşar Qaya (Qafarov Yaşar İmran oğlu) bədii yaradıcılıq istedadına malikdir. Azərbaycan Yazıçılar Birliyinin üzvüdür. Gədəbəyin Böyük Qaramurad kəndindən olan bu gənc "Qürbət elin şadlığı da kədərdir" şeirlər kitabının müəllifidir. Millət vəkili Qənirə Paşayevanın ona göstərdiyi diqqət və qayğıdan çox razılıq edir. Biz onun Qənirə Paşayevaya həsr etdiyi "El qızı" adlı şeirini oxumağı da unutmadı. Şeiri təqdim edirik:

Səni sən tək tanımışıq həmişə,
Şöhrətinə halal olsun, el qızı!
Başıuca, alnıaçıq, üzüağ,
İsmətinə halal olsun, el qızı!

Hamı səndən, sən hamıdan razısan,
Könüllərin baharısan, yazısan,
Azərbaycan millətinin qızısan,
Millətinə halal olsun, el qızı!

Zəfər adlı xoş niyyətin var sənin,
İnsanlara səmimiyyətin var sənin,
Nigarısan, Həcərisən Vətənin,
Qeyrətinə halal olsun, el qızı!

Tale sənə böyük hünər veribdi,
Bu el görür veribdi daha nələr
Qiymətini Ulu Öndər veribdi,
Qismətinə halal olsun, el qızı!

Yaşar Qayanın satirik mövzuda yazdığı şeirlər də diqqət çəkir.

### Yeddi qoyunun taleyi

Duymuşlar kimlərə yem olduqların
Əvvəldən dərdini bilən qoyunlar,
Yeddisi bir yerdə səs-səsə verib,
Mələşə-mələşə gələn qoyunlar.

Hər kəsdə bir olmaz döyünən ürək,
Düzgün, insaflılar tapılar tək-tək,
"Sizmi yeyəcəksiz bizi", deyərək,
Baxıb tamahkara gülən qoyunlar.

Hamısın özünə yem etdi harın,
Dərdi nə vecinə ac qalanların,
Olmadı qocaman canavarların
Tülkülər, çaqqallar bölən qoyunlar.

Lənət o vicdana, lənət o ada,
Özündən qeyrilər düşməyir yada,
Bu gün başqa evdə bişir tavada,
Dünən qurbanlığa gələn qoyunlar.

### Yazanmaz

Şair əgər aşiq olub sevməsə,
Gözəlliyə vurulmasa - yazanmaz.
Bulaq kimi daxilindən qaynayıb,
Göz yaşı tək durulmasa - yazanmaz.

Tər gülünü vədəsində dərməsə,
Könül alıb, nə də könül verməsə,
O anları yaşamasa, görməsə,
Himi bu cür qurulmasa - yazanmaz.

Yaşar Qaya, vətən bizim, yurd bizim,
Fərqi yoxdur aran gəzim, dağ gəzim,
Sevgisiylə coşan şair, əzizim,
Öz gülünə sarılmasa - yazanmaz.

* * *

Bu ziyarətdən hər iki tərəf məmnun qaldı. Həm pansionatın sakinləri olan ağsaqqal və ağbirçəklər, həm də AQAC-ın ADPU bölməsinin üzvləri. Ən azından ona görə ki, birincilər unudulmadıqlarını bir daha əyani gördülər. Digər tərəf isə bu ziyarətləri ilə ağsaqqal, ağbirçəklər qarşısında imkanları hesabına insanlıq borclarını yerinə yetirdiklərinə görə özlərindən razı qaldılar.



**Ayətxan ZİYAD,**
**Gülnar BƏXTİYARQIZI**

## Müəllimləri qoruyun!

Yazın istisindən, yayın odundan
Düzlər alovlanar, düzlər sönər də
Yazın yağışından, yaz buludundan
Düzlər çiçək açıb təzələnər də -
Müəllimi qoruyun,
Müəllim solmasın.

Qışın soyuğundan, qışın üzündən
Ən uca zirvələr görünməz qarda.
Nur əmib günəşin qaynar gözündən
Dağlar cana gəlib cavanlaşar da -
Müəllimi qoruyun,
Müəllim solmasın.

**Taisə Quliyeva,**
**Xarici dillər kafedrasının baş müəllimi**

# "Gəlin yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olaq!"

*Pedaqogika və psixologiya fakültəsi bu məqsədlə həyata keçirdiyi xeyirxah tədbirlərin miqyasını genişləndirir*



Cəmiyyətin ən zərif və ən həssas sakinlərinin məskunlaşdığı məkanlar həmişə hər kəs tərəfindən ziyarət olunmalı, onlara imkan daxilində kömək edilməlidir. Adi insanlardan fərqli olaraq bəlaları daha çox diqqət və qayğıya ehtiyac duyurlar.

Universitetimizin Pedaqogika və psixologiya fakültəsinin müəllim və tələbələri fakültənin dekanı, dosent Şəhla Əliyevanın başçılığı ilə bu dəfə Bakı şəhərinin Şağan qəsəbəsində yerləşən fiziki və əqli cəhətdən qüsurlu uşaqlar üçün nəzərdə tutulmuş 3 saylı İnternat Evinin sakinlərini ziyarət edərək buranın sakinləri ilə görüşmüş, onlara sovqat aparmışlar. Görüşdə Yaş və pedaqoji psixologiya kafedrasının baş müəllimi, fakültə Həmkarlar İttifaqı Təşkilatının sədri Həqiqət Gözəlova, Ümumi psixologiya kafedrasının baş müəllimi Nailə Hüseynova, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti Şərafət Baxışova da iştirak etmişlər.

Ünsiyyətdə olduğumuz uşaqların əksəri nitq qabiliyyətindən məhrumdur. Üstəgəl, atasızlıq, anasızlıq onların qəddini boynubükük bənövşətək əymiş, kiçik vücudlarında böyük bir ağrını daşımağa məhkum etmişdir. İnsan qayğılarını ailəsi və yaxınları ilə paylaşmaqla rahatlıq tapar. Bu körpələr isə nəinki validеyn nəvazişindən, əqli və fiziki saglamlıqlarından da məhrumdurlar. Məxsusi himayəyə və qayğıya ehtiyac duyan bu uşaqları öz doğmaları qədər kim anlaya, ürək yanğılarını kim söndürə bilər?

Bu dünya bizim evimiz, bizlər isə bu dünyanın bərabərhüquqlu sakinləriyik. Bu körpələrin də digər insanlar kimi gözəl yaşamaq haqları var. Axı insan Yer üzünün ən şərəfli sakinidir. Onun bu dünya boyda evi var. Allah-Taalanın bütün verdiklərinə sahib olan bizlər dünya adlı bu evimizin varlıqlarını bir əmanət kimi dəyərləndirməli, göz-bəbəyi kimi qorumalıyıq. Axı köməyə ehtiyacı olanlara mərhəmət insani keyfiyyətlərin ən alisidir. Gəlin yaxşılıq etməkdə və pis əməllərdən çəkinməkdə əlbir olaq! Həyatımızı elə sağlam və elə düzgün quraq ki, cəmiyyətimizdə nə qocalar, nə də uşaqlar evinə ehtiyac duyulmasın.

**Gülzar ƏLƏKBƏROVA,**
**Pedaqogika və psixologiya fakültəsinin I kursunun 101-ci qrup tələbəsi**



Əbdülməcid Rzayev-90

# Kimyaçı alim, müəllim



Xalqımız, dövlətimiz həmişə özünün görkəmli alimləri, müəllim və mütəxəssisləri ilə fəxr etmişdir. Universitetimizin belə müəllimlərindən biri - əmək fəaliyyəti 1966-cı ildən universitetimizlə bağlı olan, tələbələrinin sevimli müəllimi, istedadlı alim, Üzvi kimya və kimya texnologiyası kafedrasının dosenti, kimya üzrə fəlsəfə doktoru Əbdülməcid Seyidrza oğlu Rzayevdir.

Əbdülməcid Rzayev 1923-cü il aprel ayının 15-də Qusar şəhərində anadan olmuşdur. 1929-1939-cu illərdə Qusar şəhər orta məktəbində təhsil almış, orta məktəbi bitirib Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) Kimya fakültəsinə qəbul olmuşdur. Böyük Vətən müharibəsinin başlanması ilə əlaqədar 1941-ci ilin avqust ayında səfərbərliyə alınaraq 14 tələbə yoldaşı ilə birlikdə Moskva Hərbi Kimya Akademiyasına göndərilib. Onlar 1941-1942-ci illərdə gündüz dərslərdə iştirak etmiş, gecələr isə düşmən tərəfindən evlərin damlarına atılan kiçik yandırıcı bombaları məhv etmək üçün növbə çəkmişlər. 1942-ci ildə Əbdülməcid müəllim və yoldaşları vaxtından əvvəl imtahan verərək hərbi kimyaçı mütəxəssis kimi ordu sıralarına göndərilib.

1942-ci ilin sentyabrında Qaradəniz qrupunda Qafqazın müdafiəsində iştirak edən Ə.Rzayev, 1943-cü il yanvarın 27-də Krasnodar istiqamətindəki döyüşlərdə ağır yaralanır və həmin ilin mayına qədər Gürcüstanın Telavi şəhərində müalicə alır.

Göstərdiyi igidliyə görə Ə.Rzayev Leninqrad cəbhəsi komandanlığının 035 saylı əmrinə əsasən “Qırmızı Ulduz” ordeni ilə təltif edilib. Həmin sənəddə deyilir: “Alman işğalçılarına qarşı döyüşlərdə yoldaş Ə.Rzayev özünü mərd və cəsur döyüşçü kimi göstərmiş, 1943-cü il 27 yanvarda Krasnodar ətrafında döyüşlərdə sılahlı hücüm zamanı yaralanmasına baxmayaraq, düşmənin həmləsini dəf edərək döyüş meydanını tərk etməmişdir. Leytenant Rzayev və onun komandanlığı altında olan taqım nəinki tutduğu mövqeləri saxlamış, hətta düşmənin bir piyada taqım qüvvəsini və bir tankını məhv etmişlər”.

Müalicəsi başa çatdıqdan sonra Ə.Rzayev 7 saylı minalardan zərərsizləşdirmə briqadasının tərkibində Şimali Qafqazın minalardan təmizlənməsində iştirak etmişdir.

1944-1945-ci illərdə Belarus və Leninqrad cəbhəsində döyüşlərdə iştirak etmiş və “I dərəcəli Böyük Vətən müharibəsi” ordeni ilə təltif edilmişdir.

Müharibədən sonra - 1945-1946-cı ilin noyabr ayına qədər Kareliyada meşələrin minalardan təmizlənməsi işində iştirak etmiş, 1946-ci ildə ordudan tərxis olunduqdan sonra isə yenidən ADU-da təhsilini davam etdirmişdir. 1949-cu ildə ali məktəbi bitirib üzvi kimya ixtisası üzrə aspiranturaya daxil olmuşdur.

1952-ci ildə Neft Daşlarının korroziyadan qorunması üçün yaradılan Bakı Lak Rəng İstehsalat Birliyinə işə göndərilmiş, əvvəl istehsalat şöbə rəisi, baş mühəndis, 1955-1961-ci illərdə həmin birliyin direktoru vəzifəsində çalışmışdır.

1961-ci ildə Neft-Kimya Prosesləri İnstitutunda laboratoriya müdirinin müavini vəzifəsinə işə qəbul edilmiş, 1963-cü ildə “Qlikol efirləri və naften turşularının emalı” mövzusunda müvəffəqiyyətlə namizədlik dissertasiyası müdafiə etmişdir. 1966-cı ilə qədər həmin institutda baş elmi işçi vəzifəsində çalışmışdır.

Əbdülməcid müəllim naften turşuları əsasında plastifikator alınması prosesinin yeni əlverişli texnologiyasını yaratmış, müəlliflik şəhadətnaməsi almışdır. “ANAZ” adlanan bu plastifikator institutun sınaq təcrübə bazasında istehsal olunmuş, Sovet İttifaqının onlarla zavodunda sınaqdan keçirilmiş, sənaye miqyasında istehsalı tövsiyə edilmişdir. Bədxah qonşularımız burda da öz naqis mövqelərindən əl çəkməyib bu sənaye prosesinin tətbiqinə mane olmuşlar. Belə ki, istehsal olunan bu plastifikator xaricdə (İtaliyada erməni korporasiyasında) istehsal olunandan 10 dəfə ucuz başa gəlməsinə baxmayaraq, keçmiş SSRİ-nin Kimya sənayesi naziri milliyyətcə erməni olan Konstantyan buna icazə verməmişdir.

1966-cı ilin may ayında ADPU-nun Təbiyyat fakültəsi kimya və biologiya fakültələrinə ayrıldıqda Ə.Rzayev Üzvi kimya və kimya texnologiyası kafedrasına müdir vəzifəsinə dəvət olunmuş, 1972-ci ilə kimi həmin vəzifədə çalışmışdır. Əbdülməcid müəllimin kafedrada işə başlaması ilə fakültədə elmi-tədqiqat işləri canlanır, yeni laboratoriyalar açılır, laboratoriyalar avadanlıq və reaktivlə təchiz edilir. Əbdülməcid müəllim kafedrada yeni sintez edilmiş maddələrin element analizi laboratoriyası təşkil edir. İndiyədək onun rəhbərliyi altında 6 nəfər kimya üzrə fəlsəfə doktoru (İsmayıl Səfərov, Nüsrət Şükürov, Yavər Qasımova, Sevil Əliyeva, Fətulla Abdullayev, Fərqanə Dadaşova) hazırlanmışdır.

Tələbələri arasında AMEA-nın müxbir üzvü, professor, elmlər doktoru, zavod direktoru vəzifəsində çalışanlar var. O, BDU-da fəaliyyət göstərən Dissertasiya Şurasının üzvüdür.

Ə.Rzayev 2012-ci ildə ADPU-nun 90 illik yubileyi ilə əlaqədar “Əməkdar müəllim” fəxri adına layiq görülüb. 100-dən çox elmi məqalənin, 10-dan artıq kitab, 25 müəlliflik şəhadətnaməsi və 3 patentin müəllifi, adları aşağı göstərilən dərs vəsaitlərinin müəlliflərindən biridir:

1. “Üzvi sintez sual və cavablarda”, Bakı - “Nurlan” nəşriyyatı -2004;
2. “Üzvi kimyanın nəzəri əsasları və üzvi sintezdən yoxlama testlər”, Bakı - ADPU - 2010;
3. “Element üzvi birləşmələr testlərdə”, Bakı - ADPU - 2011;
4. “Neft-kimyəvi sintezdən 707 yoxlama testlər”, Bakı - ADPU - 2012

Əbdülməcid müəllim öz dərin biliyi, alicənablığı, sadəliyi ilə universitetimizin professor-müəllim heyətinin və tələbə kollektivinin dərin rəğbətini qazanıb. “Əbdülməcid müəllim Kimya fakültəsinin canlı ensklopediyasıdır” desək, yanılmarıq. O, indi də maraqlı, dərin məzmunlu seminar dərsləri aparır. Biz Əbdülməcid müəllimdən öyrənir və ona böyük hörmət bəsləyirik.

Aprelin 15-də Əbdülməcid müəllimin 90 yaşı tamam oldu. Biz bu yubiley münasibətilə Əbdülməcid müəllimi ürəkdən təbrik edir, Allah-Taaladan ona gümrahlıq, cansağlığı arzulayırıq.

**Ədilə MAHMUDOVA,**
**Kimya fakültəsinin**
**dekan müavini, dosent**

---

**Oqtay Rzanın**
**kimlik tarixi barədə**

Müəllifin özü bu barədə kitabına daxil etdiyi və “İki kimlik tarixim...” adlandırdığı yazısında bəhs edir. Yazır ki, ötən əsrin 30-cu illərinin repressiyası (kütləvi cəza bəlası) məni də yetim qoyub. Keçmiş APİ-nin (indiki ADPU-nun) dil-ədəbiyyat fakültəsinin məzunu, Bankədə, Xıllıda, İsmayıllıda, Şıxlarda (indiki Cəlilabad rayonunda kənddir) məktəb direktoru vəzifəsində çalışmış atam Məhərrəm Rzazadə 1940-cı ilin sonunda, hələ 33 yaşında ikən həbsxanada ömrünü başa vurub. Qəbiri tapılmasa da, ailənin təsəlli yeri o olub ki, Məhərrəm kişinin nəşi Azərbaycan torpağına qarışıb.

Müəllif atası haqqında xatirələrində yazır ki, atamın “Bakı-Astara dəmir yolunun çəkilişində əl arabası ilə torpaq daşıması daim gözlərimin qabağındadır. Qohumların vahimə içində atamın kitablarını, sənədlərini təndirə atıb yandırmaqları da yadımdadır. Görünür yaş kağızım elə o vaxt yanıb külə dönüb. Çünki doğum haqqında şəhadətnaməmdə milliyyəti qırafasında *“türk”* sözü varmış. Bu, doğmalarımı bərk qorxudubmuş.

...1941-ci ilin sentyabrında məni Qalalı adlanan kəndimizdəki yeddiillik məktəbə yazdıranda anam və dayım arvadı “Oktyabr bayramı günlərində doğulub” fikrinə istinadən kimlik tariximi “1934-cü il 2 noyabr” kimi yazdırıblar.

...Təzə şəxsiyyət vəsiqəsində soyadımı Rzalı yazdırmaqdan ötrü dedilər ki, əvvəl gərək yaş kağızında düzəliş etdirəsən. Cüzi (dörd-beş faiz) ümidlə Salyana yollandım. VVAQ-ın arxivində yarım saatlıq axtarış aparan Nayibə xanım məni sevindirdi: “Oqtay müəllim, yaş kağızınızın ilk nüsxəsi bizdə qalıbmış”. Uşaq kimi fərəhləndim. Sən demə dəqiq kimlik tarixim 1934-cü ilin 10 oktyabrı imiş. İndi müəllif kimi Oqtay Rza, vətəndaş kimi Rzalı Oqtay Məhərrəm oğluyam. Həyatımın ahıllıq mərhələsində bilmişəm ki, mən oktyabrın 10-da dünyaya gəlmişəm. Görəsən, bundan sonra hər il ad günümü iki dəfə qeyd etməyimə necə baxarlar? Axı “iki noyabr” nə az-nə çox, düz 71 il kimlik tariximdə öz əksini tapıb. Beləliklə, çoxları kimi özüm də qəribə tale yolları keçmişəm...”.




***Azərbaycan Yazıçılar Birliyinin üzvü, şair Oqtay Rza yaxınlarda işıq üzü görmüş kitabını belə adlandırıb. Bu kitabı ömrünün müdrik yaş dövrünü - 79-cu ilini yaşayan Oqtay Rzanın həyatının 80 illiyinə müəllif töhfəsi kimi də dəyərləndirmək olar.***

***Adından da göründüyü kimi, oxucuya təqdim olunan kitab ADPU-nun dosenti, Əməkdar müəllim, Azərbaycan Yazıçılar Birliyinin üzvü, Beynəlxalq R.Rza, Mikayıl Müşfiq və “Araz” ali ədəbi mükafatlarının laureatı, 1971-ci ildən “Qızıl qələm” mükafatının sahibi Oqtay Rzanın oxucuları ilə növbəti görüşüdür.***

***Çox məqamlarda özünəməxsusluğu ilə diqqət çəkən O.Rza kitabına daxil etdiyi şeirlərin düzümündə də özünəməxsusluq nümayiş etdirmiş, sərlövhələri əlifba sırası ilə düzənləmişdir. “İlk dəfə topluya düşən misralar” adlandırdığı bölümdə ayrı-ayrı illərin yazılarından seçmələr daxil edilmişdir.***

**Bəs Oqtaysevərlər, yaxın ünsiyyətdə olduqları Oqtay Rza haqqında hansı düşüncədədirlər?**

“Oqtay müəllim ana yurdunun vurğunu, onu dəlicəsinə sevən bir insandır. O, Vətənlə nəfəs alır, Vətənlə öyünür və böyük fəxarətlə özünü Azərbaycan torpağının balası sayır:

*Yurdum odlar diyarıdır,*
*Bu torpağın balasıyam;*
*İlhamımı ömür boyu*
*Vətənimdən alasıyam.*

* * *

Şair təkcə ilham almaqla da kifayətlənmir, xəyalı onu çox-çox uzaqlara aparır. O, bu xəyal dünyasında bir nəğməyə çevrilmək, ürəklərə qonmaq, Nəsimi kimi o yuvada qalmaq istəyir. Şair bu böyük diləyini, dünyalara bərabər sonsuz arzularını ikicə misraya sığışdırır:

*Nəğməyə çevrilib bu xoş həyatda*
*Qalmaq istəyirəm Nəsimi kimi!*

**Seyran Kazımoğlu,**
**filologiya üzrə fəlsəfə doktoru**

* * *

“Yaşının müdriklik çağında da məhsuldar bədii yaradıcılıqla məşğul olan sevimli şair, pedaqoq, alim Oqtay Rzanın yeni “Adlı, ünvanlı misralar” toplusunun ikinci hissəsi müəllifin 1999-cu ildə nəşr etdirdiyi eyniadlı şeirlər kitabının davamıdır. Kitabdakı poetik nümunələrin ünvanlarından, bədii obyektlərindən də görünür ki, sözə və insanlara sənətkar həssaslığı ilə yanaşan Oqtay Rza üçün Azərbaycan yalnız cansız coğrafi ərazi, ruhsuz siyasi məkan deyil, öncə Vətənin saylı-seçimli şəxsiyyətləri, sadə adamları, işıqlı fərdləridir...”

**Aydın Xan,**
**tənqidçi-publisist**

* * *

“Bir dəfə Bəxtiyar Vahabzadə ilə poeziyamızın ümumi mənzərəsi haqqında söhbət edirdik. O, bir sıra qələm sahibləri arasında Oqtay Rzanın da adını xüsusi hörmətlə çəkdi. Dedi ki, Oqtay Rza mənə kitab göndərmişdi: “Daş çırağın işığında”nı. Əsər məni tutdu. Birnəfəsə oxudum. Özümə borc bildim ki, onu evimə qonaq çağırım. Oturduq, xeyli dərdləşdik. Şeirlərindəki məziyyətlərdən danışanda bir az sıxılan kimi oldu. Bu, onun təvazökarlığından irəli gəlir. Təəssüf ki, söz adamları arasında belələri o qədər də çox deyil. O, həyatdan gələn şairdir, gördüyünü, duyduğunu yazır. Oqtayın şeirlərində doğma torpağın nəfəsi, nəğmə səsi var.

Mən Bəxtiyar müəllimə dedim: “Çox sağ olun ki, Oqtay Rzadan belə geniş ürəklə söz açdınız”.

O gülümsəyərək, “Bu onun haqqıdır, şair kimi də, insan kimi də, şəxsiyyət kimi də” dedi...

**Nahid Hacızadə,**
**yazıçı-publisist,**
**“Azərbaycan Respublikası Xatirə kitabı”nın baş redaktoru,**
**Əməkdar incəsənət xadimi**

* * *

“Oqtay Rza - dövrümüzün Ömər Xəyyamı”.

**Rafiq Fərəcov,**
**“Vətən səsi” qəzetinin**
**baş redaktoru**

* * *

“Həm təbiətin, həm də insanların bənzərsizliyi, üzvi aləmdəki ziddiyyətlər, insan xarakterinin müxtəlifliyi də onun dördlüklərində öz əksini tapır. Poetik ustalıq, bacarıq elə ondadır ki, bir neçə misra ilə böyük məna vəsf edəsən, reallığa, həqiqətə, varlığa poeziya donu geydirə biləsən.

Oqtay Rza “Rübai karvanı...”nın sarvanıdır. O, rübainin imkanları daxilində həmçinin satiranı, tarixi hadisələri, fəlsəfi düçüncələri də poetik dillə tərənnüm etməyə cəhd göstərir”.

**Vaqif Arzumanlı,**
**filologiya üzrə**
**elmlər doktoru, professor**

* * *

“Səsin rəqsi, səsin rəngi olduğu kimi sözün düzülüşü, sözün də rəqsi var. Vallah, Oqtay Rza şeirlərində sözlər elə sıralanır ki, sanki rəqs edir. Bu rəqs ergenikondan boy verir. Şair, sözü layla-rın-dan çıxararaq, inciləri yarpaq-yarpaq düzərək canlandırır. Əsgər sevdalı Vətən sərhədlərini gəzdiyi kimi, o da əsgər kimi sözün düzü-lüşünə nizam qələmi çəkməyi bacarır. Misralarında özünün kimliyi açıqlanır:

*Qılıncı qınına qoymayan şair*
*Bəzən uşaq kimi küsəyən olur.*
*Şahı, sərkərdəni saymayan şair*
*Zərif gözəlliyə baş əyən olur.*

**Ədilə Ağabəyli,**
**yazıçı-publisist**

* * *

Yeddi bölümdən (“Salam, məmləkətim! Sağ ol, millətim!”, “Təbiətin yaşıdıdır məhəbbət”, “Dinləsin planet, dinləsin bəşər”, “Rübai karvanı...”m hələ yoldadır”, “Nəğməm gələcəyə aparır Sizi”, “Özümdən sonra da varam, ürəyim!”, “İlk dəf topluya düşən misralar”) ibarət olan topluya şairin müxtəlif illərdə qələmə aldığı şeirlərindən nümunələr daxil edilmişdir. Redaktor Dəyanət Osmanlının və tərtibçi redaktor Ayətxan Ziyadın ərsəyə gətirdikləri 252 səhifədən ibarət “İyirminci kitabım” “AZATAM” nəşriyyatında nəşr edilmişdir.

**Ayətxan Ziyad**

# Müasir Azərbaycan uşaq şeirində folklor motivləri: XX əsrin II yarısından sonrakı dövr

**Azərbaycan uşaq şeiri yaranma dövründən asılı olmayaraq mövzu baxımından üç istiqamətdə inkişaf edib: 1 - zəngin xalq folklorundan bəhrələnərək milli mövzu çərçivəsində; 2 - müasir həyatdan alınmış mövzu əhatəsində; 3 - ümumbəşəri mövzular civarında.**

**Dünya miqyasında folklor mühiti zənginləşdikcə yazılı uşaq ədəbiyyatı bu mənbələrdən qidalanmış, rəngarəng janrlı əsərlər meydana gəlmişdir. Əsatir, əfsanə, rəvayət, nağıl, dastan və s. folklor nümunələrindən yetərincə qida almış uşaqlar üçün yazılmış əsərlər maddi və mənəvi mədəniyyətimizin əsas tərkib hissəsini özündə yaşada bilmişdir.**



XX əsrin 60-90-cı illərində folklor motivlərindən bəhrələnərək yeni, aktual mövzuları işləmək marağının artdığı, müşahidələrin genişləndiyi, ədəbi qəhrəmanların daxili aləminə daha dərindən nüfuz etmək meylinin gücləndiyi müşahidə olunur. T.Elçin, X.Əlibəyli, İ.Tapdıq, M.Günər, T.Mütəllibov, H.Ziya, T.Mahmud, M.Aslan, Z.Xəlil, M.Namaz, Q.İsabəyli, Ə.Quluzadə, R.Yusifoğlu, S.Nuruqızı və digər poetik qələm sahibləri uşaq poeziyası sahəsində yetərincə iz qoymuşlar.

Tanınmış yazıçı və ədəbiyyatşünas, uşaq ədəbiyyatı problemlərinin həlli yollarını axtaran Elçin Əfəndiyev yazır: "Bizim uşaq ədəbiyyatı istedadla yazılmış nümunələrində uşaqlarla folklora xas olan aydın və şirin bir dillə danışmağı bacarır, xalq ruhunu qoruya bilir, folklorun əsas motivlərini təşkil edən xeyirxahlıq, dostluq, səadət, etibar və qəhrəmanlıq kimi yüksək mənəvi keyfiyyətləri xalq deyim tərzinə müvafiq bir təbiiliklə təlqin edir və bütün bunlar həmin əsərlərə uşaq psixolojisinin və hafizəsinin aparıcı istiqamətini təşkil edən metaforizm gətirir, nəticə etibarilə də uşaq ədəbiyyatının üslubi imkanlarını genişləndirir".

Qələmə alınmış bədii materialları araşdırdıqca bu və ya digər sənətkarların folklor motivləri əsasında yaratdıqları əsərlərə rast gəlirik. Azərbaycan klassik poeziyanın bilicisi, dünya ədəbiyyatı ilə müntəzəm təmasda olan, bədii tərcümələri ilə seçilən, zəngin xalq yaradıcılığı motivlərindən məharətlə istifadə edərək balaca oxucuları sevindirən Teymur Elçin «Analar və laylalar» şeirlər silsiləsində öz sənətkarlıq mənerasına sadiq qalmışdır. Adı çəkilən şeirlər silsiləsində şair oxucularına aşılayır ki, təbiətdə tutduğu mövqeyinə, fəaliyyətinə, xarakterinə görə biri-birindən fərqli görünən heyvanların və quşların hər birinə öz balası əzizdir. Şair alleqorik üsuldan istifadə edərək bu canlıların hər birinin xarakterini onların özünəməxsus dili ilə oxucuya təqdim edir.

Azərbaycan uşaq ədəbiyyatının çoxsaylı qələm sahibləri arasında X.Əlibəyli bir cəhəti ilə seçilir. O, ömrünü yalnız uşaqlara həsr etmiş, gənc nəsil üçün folklor süjetli nağıllar yazmış, maraqlı xalq deyimləri haqqında düşünmüş, hətta dram əsərlərini də bu ruhda yaratmış, süjetli şeirlərində hər bir dialoqu poetik səviyyəyə qaldıra bilmişdir.

Tanınmış uşaq şairi İ.Tapdığın yaradıcılığında xalq poeziyasının ruhu duyulur. Obrazlılıq keyfiyyətinin misralara hopması, şairin sənətkarlıq məharəti «Təpələr» şeirində daha səciyyəvi nəzərə çarpır. El ədəbiyyatının yanıltmac janrına daha çox bənzəyən bu şeir uşaqların dilində daha rəvan və oynaq səslənir.

Təmsil ustası H.Ziya folklor motivlərindən məharətlə istifadə edərək, dərin məna kəsb edən mənzum nağıllar qələmə almışdır. Xalq rəvayəti əsasında yazdığı «Bağbanın qisası», öz yığcamlığı və dərin mənası ilə seçilən «Qoyunun oyunu», «Kəlilə və Dimnə»nin motivləri əsasında yaratdığı «Nənənin nağılları» şairin çoxcəhətli ədəbi yaradıcılığından xəbər verir.

Bədii axtarışlar sorağında olan Məstan Günər uşaq aləminə nüfuz etməyi bacarmışdır. Xalq yaradıcılığının qaynaqlarından, klassik ədəbiyyatın büllur çeşməsindən bəhrələnən şair uşaqların qəlbinə yol tapmış, onları poetik nümunələri ilə əfsunlamış, uşaqlar üçün yazdığı poemalar və mənzum nağılları da sənətkarlıqla qələmə almışdır. «Günəbaxan nənə», «Ağacda leylək», «Çoxbilmiş keçi», «Dəcəl dələ, qorxaq dovşan və qorxmaz küçük», «Ürəyin nağılı» kimi poema və nağıllarında uşaqların yaş xüsusiyyətləri, maraq dairəsi nəzərə alınmış, zövqünü oxşaya biləcək əhvalatların bədii təsviri əsas götürülmüşdür.

Z.Xəlilin alleqorik nağıl motivləri əsasında qələmə aldığı «Çinarların yuxusu», «Siçanların kələyi» və sair epik əsərləri maraqlı süjeti ilə diqqəti cəlb edir. Bəzi nağıl-poemaları həcmcə kiçik olsa da, iri ölçülü nağıl təsiri bağışlayır. «Sərçələr», «Ovçu Paşabalanın macəraları», «Dəcəl səpiş və qumral quzu» və sair mənzum nağıllar orijinal mövzu və forma üzərində qurulsa da, bəzi məqamlarda burada xalq ədəbiyyatı motivlərinin təsirini duymaq olur.

Şair Qəşəm İsabəylinin uşaqlar üçün xalq deyimində yazdığı əsərlərinin rəvan ahəngi, ruhuna uyğun gələn sadəliyi və təbiiliyi, şeirlərin sadə, yeni üslublu deyim tərzi də onun üstün cəhətlərini və deyilənləri təsdiq edir. Alleqorik üsulda və mükaliмə şəklində yazılan şeir uşaqların həyata baxışını formalaşdırır, bilgisini artırır, orijinal misraların tapıntısı adamı valeh edir. Xalq ədəbiyyatı çeşməsindən qida alan bu şeirlər uşaqların yaddaşına həkk olunur. Bulaq suyu kimi şəffaf, ləzzətlə qəlbə süzülən bu səpgili şeirlər şairin poetik yaradıcılığının bəzəyinə çevrilir.

Şairi Rafiq Yusifoğlu öz yaradıcılığı ilə seçilən bir qələm sahibidir. Onun «Yurdum-yuvam», «Ətirli düymələr», «Ocaq yeri» və «Aylı cıdır» adlı uşaq şeirlər toplusu ilə ətrafına xeyli oxucu toplaya bilmişdir. Onun kitablarına müxtəlif mövzulu şeirlər, nağıl və poemalar daxil edilmişdir ki, şair yaradıcılığının əsas hissəsini folklor motivləri ilə bağlamışdır.

R.Yusifoğlunun poema-nağılları folklor motivlərindən qidalanmışdır. Onun «Ağıl döyüşü» nağılpoeması olduqca maraqlı süjet əsasında qələmə alınmış, əsərin əsas ideyası xalqın ağlını, zəkasını üzə çıxarmışdır. Düşmənin bütün suallarına müdrikcəsinə əməli surətdə cavab verən qəhrəmanların ağlına düşmənin elçisi də heyran qalır. «Gül və bülbül əfsanəsi» nağıl-poeması da şairin istedadını üzə çıxarır. «Bacadan yağan qızıl» nağıl-poeması da folklor motivlərindən yaransa da, əsərdə bir müasirlik duyulur, insanın paxılı tənqid hədəfinə çevrilir. Şairin bütün şerlərində folklor motivlərinin izləri görünür, vətən, torpaq təəssübkeşliyi, düşmənə nifrət hissləri daha qabarıq nəzərə çarpır.

Mərkəz Quliyev (Qacar) «Təmsillər» kitabına daxil etdiyi bədii yaradıcılığı ilə özünü bir satirik şair kimi təsdiq edir. Onun folklor motivlərindən və həyat müşahidələrindən aldığı mövzular bir anda dərin məzmunlu təmsillərə çevrilir, cəmiyyətimizin eyib və nöqsanları satira ilə yoğrulmuş bu janrda hər şeyi öz qiyafəsində göstərən parlaq bir güzgü mahiyyəti daşıyır. «Başsız meşə», «Qanun hazırlayan soxulcan», «Əməlini danan eşşək», «Çayırların mitinqi», «Təkəbbürlü porsuq» və sair müxtəlif mövzulu yığcam təmsillər müasir dövrün çatışmazlıqlarını ifşa obyektinə çevirir.

Akademik B.Nəbiyev yazırdı: "...Adını lap axırda çəkdiyimiz lirizm, mahiyyətcə uşaq poeziyasının çox vacib keyfiyyətlərindən biridir. Ana laylalarını, bayatıları, ağıları, şərqiləri ömrümüz boyu unudulmağa qoymayan, onların canına hopmuş dərin lirizm, ahəngdarlıq, ritm, alliterasiya, nəhayət, metafora zənginliyi deyilmi? Analar ən böyük fikir və arzularını, istək və şikayətlərini, yanğı və sızıltılarını dilbilməz övladlarının beşiyinə məhz layla vasitəsilə pıçıldayıb, ürəklərini boşaltmayıblarmı? Bütün xalqlarda sənətin ən qədim və çox yayılmış növü olan laylaları adam var saçlarına dən düşəndən sonra da dinləyəndə vücudunda yaxşı mənada bir sarsıntı duyur. Bu təsir ilk növbədə lirizmin qüvvəsində əldə edilir. Müasir uşaq şeiri laylanın bu xüsusiyyətindən öyrənməlidir..."

Belə ki, bədii fikrin, bütün məcaz növləri və poetik fiqurların ilk mənbəyi folklor sayılır. Bunu dərindən duyan sənətkarlar öz yaradıcılığında bu xəzinədən istifadə etmiş, ölməz əsərlər yaratmışlar. Duyumdan məhrum olan diletantlar isə saysız-hesabsız misraları ağ kağız üzərinə düzsələr də, uşaqların qəlbinə yol tapa bilməmiş, unudularaq ədəbi səhnədən uzaqlaşmışlar.

Uşaqlar üçün yazılan əsərlər janr xüsusiyyətindən asılı olmayaraq ədəbiyyatımızın çox zəruri olan tərkib hissəsi kimi yaş, bədii-estetik zövq və bilik səviyyəsi müxtəlif olan minlərlə insan övladı tərəfindən oxunur və dərk olunur. Yəni, cəmiyyətin mənəvi sağlamlığı, insanların yaşadığı mənəvi mühit xeyli dərəcədə mütərəqqi ədəbiyyat və incəsənətin sənətkarlıq səviyyəsi ilə müəyyən edilir. Bu ədəbiyyat cəmiyyəti yaradan insanların həyat kredosunu müəyyən etməklə yanaşı, o cümlədən, uşaq dünyasına nüfuz edir, balaca oxucuların bədii təfəkkürünün inkişafında fəal iştirakçıya çevrilir, öz ölkəsinin layiqli vətənpərvəri olan insan şəxsiyyətini yetişdirir. Balacaların, yeniyetmələrin dünyagörüşünün formalaşmasında, maraq dairəsinin genişlənməsində, əxlaqi və mənəvi tərbiyəsində, xarakterinin mətnləşməsində və ən nəhayət, bədii-estetik zövqünün cilalanmasında uşaq ədəbiyyatının rolu inkaredilməzdir.

Ədəbiyyat aləmində sənətkarlar elə mövzulardan çələng hörmüşlər ki, uzun illər ötsə də yaddaşlardan silinmir, uşaqların kövrək təfəkküründə iz salır, onlara ümumbəşəri keyfiyyət aşılayır. Uşaq poeziyasında təbiət mövzusu məhz belə səciyyəyə malikdir. Uşaqların insani duyğulara münasibətini nizamlamaq, həyata olan inamını möhkəmlətmək, onların sirli dünyanı, füsunkar təbiəti dərk edərək zərif və incə hisslərlə tərbiyə olunmasına nail olmaq üçün bu mövzularda poetik sənət əsərlərinə ehtiyac böyük olmuşdur.

Hər yaş mərhələsində uşaqların maraq dairəsi sadədən mürəkkəbə doğru inkişaf edir, xüsusilə canlı varlıqlara (heyvan və bitki aləminə) meylləri daha da artır, onlar bu sirli aləmdə maraqlı və yeni tapıntılar axtarışına çıxırlar. Bunları sənətkar duyğusu ilə hiss edən qələm sahibləri bu meyllərə uyğun olan əsərlər yazmağın istəyində olurlar. Bu mövzulara həm XIX əsrin sonu, XX əsrin əvvəllərində, həm də müasir uşaq poeziyasında rast gəlmək mümkündür.

Ümumiyyətlə, Azərbaycan uşaq şeiri dövründən asılı olmayaraq, həmişə ana dilimizin tükənməz üslubi vasitələrindən qidalanaraq poetik zənginliyə malik olmuşdur. Ana dilinin və xalq yaradıcılığının bulaq suyunun büllur çeşməsi qədər saf olan qaynaqlarından qida alan Azərbaycan uşaq poeziyası həmişə sənətkarlıq baxımından yüksəkdə dayanmışdır. V.Q.Belinski əsl ədəbiyyatın tərifini verərək yazırdı ki: «Ədəbiyyat sənətin ən zəngin növüdür. Ayrı-ayrılıqda müxtəlif incəsənət növlərinə aid olan ahəngdarlıq, musiqililik, simmetriklik, lövhəlilik, mənzərəlilik və əzəmət ədəbiyyatda bir küll halında mövcuddur, özü də söz, ifadə və cümlələrin sərrast düzümündən yaranır. Təsvir imkanlarının genişliyinə, estetik faktorlarla zənginliyinə görə bədii ədəbiyyat sənət növləri cərgəsində ilk sırada dayanır».

Bu meyarla yaranmış hər bir ədəbi janr sənətkarlıq baxımından diqqəti cəlb edir və az müddət ərzində ətrafına kifayət qədər oxucu toplaya bilir.

**FÜZULİ ƏSGƏRLİ,**
**filologiya üzrə fəlsəfə doktoru, dosent**

## Mini futbol turnirinin qalibləri mükafatlandırıldı

Yeni Azərbaycan Partiyasının yaradılmasının 20 illiyi münasibətilə ADPU-da fakültələr arasında ay yarım davam edən mini futbol turnirinə yekun vurulub. Bu münasibətlə mart ayının 6-da keçirilən yığıncağı ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev açıb, turnirin keçirilməsi barədə yığıncaq iştirakçılarına məlumat verib. Yığıncaqda həmçinin Kimya fakültəsinin dekanı, dosent Vaqif Həsənov, Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanı, dosent Nurəddin Uluxanlı, Bədən tərbiyəsi kafedrasının müdiri, dosent Əli Mehtiyev, universitet Tələbə Gənclər Təşkilatının sədri Mahmud Möhbalıyev iştirak etmiş, idmançılarımıza gələcək yarışlarda da uğurlar arzulamışlar.

Sonda mini futbol turnirinin qalibləri Səbail Rayon Gənclər və İdman İdarəsinin və ADPU-nun diplomları ilə mükafatlandırılmışlar.

**Səbinə SƏMƏDOVA,**
**Universitet TGT-nin sədr müavini, magistrant**

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi pedaqogika kafedrasının baş müəllimi Ofelya Mürsəlovaya qardaşı

**Elman Mürsəlovun**

vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

---

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Funksiyalar nəzəriyyəsi kafedrasının baş müəllimi

**Tofiq Hüseynovun**

vəfatından kədərləndiyini bildirir və mərhumun ailəsinə dərin hüznlə başsağlığı verir.

Redaktor: A. Z. İSGƏNDƏROV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi-34, ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

Mətbuat və informasiya şöbəsinin web-portalı www.press.adpu.az Şəhadətnamə № 191

Sifariş: 1441 Sayı: 1500 Çapa imzalanıb: 29.03.2013-cü il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompyuter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.